فضل

كلمة الإخلاص

# İxlas kəliməsinin fəziləti




əl-Hafiz

*İbn Rəcəb əl-Hənbəli*

## Tərcüməçinin müqəddiməsi

**Şirkdən təmiz olan Rəbbimizə həmd olsun! Şahidlik edirik ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur və şahidlik edirik ki, Muhamməd onun qulu və peyğəmbəridir.**

**Əziz müsəlmanlar!**

Sizə təqdim etdiyimiz bu risalə böyük hənbəli alimi əl-Hafiz Zeynud-Din İbn Rəcəbin iman və tövhid haqqında yazdığı bir risalənin tərcüməsidir. Bu risalənin tərcüməsində əsasən "Darul-Qasim" nəşriyyat evinin nəşr etdiyi və "Kitəbut-Təuhid" adlandırdıqları çapa arxalandıq. Kitabın bu çapını Sabri bin Sələmə Şahid təhqiq və təxric etmişdir. Bu kitab başqa adla da nəşr olunub. Bunu Misirin "Ənsarus-Sunnətil-Muhammədiyyə" camaatının böyüyü və Əzhar alimlərindən olan Şeyx Muhamməd Hamid əl-Fəqi – rahiməhullah – təhqiq edib və "Kəlimətul-İxlas va Təhqiqu Mə'anəhə" adı ilə çap olunub. Həmçinin Şeyx Nasirud-Din əl-Albani'nin təxrici ilə, Ustaz Zuheyr əş-Şəviş'in "əl-Məktəb əl-İslami" kitab evində eyni adla çap olunub. Bundan başqa yenə Əzhar alimlərindən Şeyx Usamə Muhamməd Abdul-Azim'in təhqiqi ilə nəşr olunub. Kitabın başqa əlyazmaları da mövcuddur və bunlar elm əhlindən müxtəlif kəslər tərəfindən təhqiq olunmuş və çap olunmuşdur. Bir az öncə qeyd etdiyimiz kimi bu tərcüməmizdə "Darul-Qasim" çapına arxalandıq, çünki muhaqqiq Sabri bin Sələmə Şahin'in kitabın əvvəlində işarə etdiyi kimi bu çap ən mötəbər əlyazmaya əsaslanır. İşarə etdiyimiz həmin əlyazmanı Muhamməd bin Muhamməd bin Abdud-Daim əl-Hənbəli – rahiməhullah – hicri 787-ci ildə yazmışdır və bilirik ki, müəllif İbn Rəcəb – rahiməhullah – özü hicri 795-ci ildə vəfat etmişdir. Bu öz növbəsində kitabın İbn Rəcəbin sağ olduğu zaman köçürüldüyünü göstərir. Bu əlyazma İmam Muhamməd bin Suud islami inuviersitetinin mərkəzi kitabxanasında ح/4761 rəqəmi ilə mühafizə olunur.

Risaləmizdə Ustaz Sabri bin Sələmə'nin kitaba yazdığı təhqiqi də tərcümə etdik, təhqiqdə onun fərqli əlyazmalar arasındakı fərqlə bağlı əlavə etdiyi qeydləri çıxardıq, çünki azərbaycanlı oxucu üçün bunun xüsusi bir əhəmiyyəti yoxdur. Eynilə Ustaz Zuheyr əş-Şəviş'in təhqiqinə də baxdıq və oradakı faydalı məqamları tərcüməmizə əlavə etdik. Əsasən kitabda bəzi tanınmamış kəslərin qısa tərcümələrini "əl-Məktəbul-İsləmi" çapından götürmüşük.

Bizim bu risaləni çox dəyərli şeyx Abdur-Rahmən bin Nasir əl-Bərrak – hafizəhullah – şərh etmişdir. Şərhində Ustaz Sabri'nin risaləyə yazdığı müqəddiməni və təhqiqini təriflәmişdir. Biz münasib yerlərdə Şeyx Abdur-Rahmən əl-Bərrak'ın sözlərini qeydlərə əlavə etdik. Ümumiyyətlə öz qeydlərimiz ilə Ustaz Sabri'nin qeydlərini ayırmaq üçün öz qeydlərimizin başında həmişə qırmızı rəngdə "tərcüməçi" sözü ilə başlamışıq.

Bu risalənin əhəmiyyəti böyükdür, çünki müsəlmanların qəlblərində tövhid sözlərinin fəzilətinin əzəmətini hiss etdirir. Müsəlmanlara tövhidin dəyərini, onun həyatda yaşamın qayəsi olduğunu xatırladaraq onları dinlərində möhkəm olmağa çağırır. Şeyx Abdur-Rahmən

əl-Bərrak'ın da dediyi kimi sanki müəllif – rahiməhullah – bunu dərslərinin birində imla etmiş və tələbələri yazmışdır. Çünki risalənin başlama tərzi buna işarə edir.

Sonunda qeyd etməliyik ki, bu risaləmizdə nə qədər dəqiq olmağa çalışsaq da xəta etməyimiz adi bir haldır. Əgər tərcüməmizdə hər hansı bir xətaya yol vermişiksə, bu, bizim öz xətalarımızdır. Allahdan xətalarımıza görə bağışlanma diləyirik. Kitabda etdiyimiz hər doğru tərcümə isə Allahın lütfüdür.

Müsəlman qardaşlarımızdan xahiş edirik ki, Allahın yoluna dəvətdə fəal olsunlar və bu kitabların haqqını verərək onları müsəlman oxuculara çatdırsınlar. Kitabı dəvət üçün istifadə etmək üçün bizdən izn almağa ehtiyac yoxdur, çünki kitabın hazırlanma məqsədi də elə budur.

Dualarınızda bizi unutmayın!

Samir Firdovsioğlu

2010.02.05

# Müəllif

İmam əl-Hafiz Zeynu'd-Din Əbu'l-Fərəc Abdu'r-Rahmən bin Şihəbi'd-Din Əhməd bin Rəcəb İbn Əbi'l-Bərakət Məsud əs-Səlami əl-Bağdadi, sonra əd-Diməşqi əl-Hənbəli müəllifin tam adıdır. İbn Rəcəb adı ilə məşhurdur.

Bağdadda hicri 736-cı ildə rabiul-əvval ayında dünyaya gəlib. Sonra hicri 744-cü ildə atası Alləmə Şihəbu'd-Din Əhməd ilə birlikdə Dəməşqə köçür. Orada "əş-Şamiyyə" məktəbində dərs deyən Şeyx Şəmsu'd-Din Muhamməd bin Əbi Bəkr bin ən-Naqib'dən icazə əldə edir. Məkkədə Şeyx əl-Fəxr ət-Təvazəri, Dəməşqdə Alləmə İbnu'l-Xabbəz və onun müasirləri, Misirdə isə Alləmə əl-Məydumi yanında kitab oxumuşdur. Sonra zamanının əməl edən ən böyük alimlərindən birinə çevrilir. Hədis və hədis illətləri haqqındakı elmə yiyələnmiş, Quranı rəvayətləri ilə birlikdə öyrənmiş, fiqh, usul, zühd və ədəb elmində yüksəlmiş, sonunda hənbəli məzhəbində yüksək məqama çatmışdır.

Bağdad, Misir, Məkkə və Dəməşqə əsrinin bir çox böyük fəqihləri və mühəddisləri yanında dərs almışdır. Hamıdan qabaq atasının yanında şagirdlik etmiş, sonra hicri 761-ci dilə vəfat etmiş əl-Hafiz əl-Aləi'nin yanında dərs almış. Hicri 751-ci ildə vəfat etmiş İmam İbnul-Qayyim əl-Cəvziyyə'nin yanında elm öyrənir. Hicri 765-ci ildə vəfat etmiş Alləmə Muhamməd əl-Qalənisi əl-Hənbəli, eləcədə Alləmə İbn Abdilhadi və Alləmə İbn Qadi əl-Cəbəl yanında elm almışdır.

Bir çox məşhur tələbələri olmuşdur. Onun tələbələri arasında bəlkə də ən böyüyü və ən məşhuru Alləmə əl-Hafiz İbn Hacər əl-Asqalani'dir.  Digər məşhur tələbələri arasında Abdur-Rahmən bin Ayyəş əd-Diməşqi, İbnul-Munsafi və İbnul-Ləhham və başqalarını göstərmək olar.

Bir çox əsərlərin sahibidir. əl-Buxari'nin "əs-Sahih" əsərinə "Fəthul-Bari" adında bir şərh yazmışdır, lakin tamamlaya bilməmiş, yalnız "cənazə" bölməsinə qədər olan hissəni şərh etmişdir. Digər kitabları içində "Şərhu İləlit-Tirmizi", "Camiul-Ulum val-Hikəm", "Zeylu Tabəqatil-Hənəbilə", "əl-Qavaidul-Fiqhiyyə", "Lətaiful-Məarif", "əl-İstixrac li Əhkamil-Xarac", "Nurul-İqtibas fi Şərhi Hədisi Vasiyyətin –Nəbi (salləllahu aleyhi va səlləm) li İbn Abbas", "ət-Təxvif min ən-Nar", "Əhvalul-Qubur", "Fadlu İlmis-Sələf aləl-Xaləf", "Mə Zibən Caiən" hədisinin şərhi, "Kəşful-Kurbə fi Vasfi Hali Əhlil-Ğurbə", "əl-Fərqu beynən-Nasihə vat-Ta'yir", "Ğayətun-Nəfi", "Təsəlliyətu Nufusin-Nisə var-Ricəl", "İxtiyarul-Əulə", "əl-Xuşu fis-Salə" və başqa əsərləri vardır. Ustaz Humməm Abdur-Rahim Said onun kitablarının hamısını qeyd etmiş və onların sayını əlli kitab və risalə olaraq müəyyən etmişdir. Bunun üçün onun "İləlul-Hədis" kitabına (səh: 252-256) bax!

Alimlər onun fəzilətini, elmini və zühdünü etiraf edərək şanına təriflər söyləmiş, məqamının yüksəkliyinə işarə etmişlər. Tələbəsi əl-Hafiz İbn Hacər onun haqqında deyir: "**Şeyx, muhəddis və əl-Hafiz!**" Yenə deyir: "**Hədis sənətində adlar, ravilər, illətlər, rəvayət yolları, mənaları ilə tanışlıq baxımından mahir bir alim olmuşdur.**" Bir başqa yerdə deyir: "**İbadət**

**və təhəccüd əhli idi. İnsanlardan uzaq idi, onlarla qarışmazdı. Hökm sahiblərindən heç kəsin yanına gedib gəlməzdi.**”

Alləmə İbn Həcci onun haqqında deyir: “**Hədis sənətində mükəmməlləşmiş, illətlər və rəvayət yollarını araşdırmaq baxımından əsrinin ən elmli aliminə çevrilmişdi.**” Alləmə İbn Nasir əd-Din əd-Diməşqi onun haqqında deyir: “**Şeyx, imam, alləmə, zahid, nümunə, bərəkət, hafiz, dayaq, etibarlı bir şəxs, hüccət, müsəlmanların nəsihətçisi, muhəddislərin fayda mənbəyi idi.**” Alləmə əl-Uleymi deyir: “**Bütün firqələr onun üzərində icma etmiş, insanların qəlbləri ona qarşı sevgi ilə dolmuşdur.**” əl-Hafiz əs-Suyuti deyir: “**İmamdır, hafizdir, muhəddis, fəqih və müsəlmanlara vaaz edəndir.**”

Hicri 795-ci ildə rəcəb ayında , bəzilərinə görə isə ramazan ayında, bazar ertəsi günü Dəməşqdə vəfat etmişdir. “əl-Babus-Sağir” adlı məqbərədə fəqih və zahid Şeyx Əbul-Fərəc Abdulvahid bin Muhamməd əş-Şirazi əl-Maqdisi’nin yanında dəfn olundu.

əş-Şeyx əl-İmam əl-Alim əl-Allamə əl-Hafiz əl-Mutqin əl-Muharrir əl-Mufid Zeyn əd-Din Aləm əz-Zuhhəd val-Huffəz val-Mutəkəllimin Əbul-Fəth Abdurrahmən İbn əş-Şeyx əl-İmam əs-Saleh əz-Zahid əl-Muqri Şihəb əd-Din Əbil-Abbas İbn Racəb əl-Bağdadi əl-Hənbəli'nin sözləri ilə

# TÖVHİD KİTABI

Allah onu rəhməti və razılığı ilə bürüsün və onu Cənnət otaqlarında məskun etsin!

## Rəhimli və Mərhəmətli Allahın adı ilə!

**Əş-Şeyx əl-İmam əl-Alim əl-Amil əl-Alləmə əl-Qudvə əl-Hafiz Zeyn əd-Din Abdurrahmən bin əş-Şeyx əs-Saleh əl-Alləmə Əhməd bin Racəb əl-Hənbəli əl-Bağdadi –** *Allah bizləri onunla davamlı faydalandırsın! Amin!* - **dedi:**

“əs-Səhiheyn”də Ənəs bin Malik’dən belə dediyi rəvayət olunur: “Peyğəmbər – *salləllahu aleyhi va salləm* – və Muaz onun yedəyində minik üzərində idilər və dedi: “Ey Muaz!” Dedi: “Buyur Allahın Elçisi! Əmrin altındayam!” Dedi: “Ey Muaz!” Dedi: “Buyur Allahın Elçisi! Əmrin altındayam!” Dedi: “Ey Muaz!” Dedi: “Buyur Allahın Elçisi! Əmrin altındayam!” Dedi: “Allahdan başqa (ibadətə layiq) bir ilahın olmadığına və Muhamməddin Onun qulu və Elçisi olduğuna şahidlik edən elə bir qul yoxdur ki, Allah ona cəhənnəmi haram etməsin!” Dedi: “Ey Allahın Elçisi! İnsanların sevinməsi üçün bunu onlara xəbər verməyimmi?” Dedi: “O zaman insanlar tənbəlləşərlər.” Muaz ölməmişdən qabaq günaha düşməkdən qorxduğu üçün bu barədə xəbər verdi.”[1]

“əs-Səhiheyn”də İtban bin Malik vasitəsilə peyğəmbərdən – *salləllahu aleyhi va salləm* – belə dediyi rəvayət olunur: “Allahın vəchini diləyərək “Allahdan başqa (ibadətə layiq) bir ilah yoxdur” - deyən kəsi Allah cəhənnəmə haram etmişdir.”

“Sahih Muslim”də Əbu Hureyrə’dən və ya Əbu Said’dən, (ravinin) şəkk edərək[2] rəvayət etdiyi hədisdə gəlmişdir ki, onlar peyğəmbərlə - *salləllahu aleyhi va salləm* – Tabuk döyüşündə olarkən onlara aclıq isabət etdi. Peyğəmbər – *salləllahu aleyhi va salləm* – dəri süfrələrdən birini tələb etdi və onu yerə sərdi. Sonra onların azuqələrindən artıq olanları tələb etdi və onlardan kimisi ovuc dolu buğda, kimisi ovuc dolusu xurma gətirdi, kimisi isə daha çox gətirdi. Süfrədə bir miqdar azuqə toplandı. Allahın Elçisi – *salləllahu aleyhi va salləm* – bərəkət duası oxudu. Sonra dedi: “Qablarınızı doldurun!” Qabını doldurmamış bir əskər belə qalmayana qədər hər kəs qabını doldurdu. Dedi: Doyana qədər yedilər, hətta yeməkdən artıq belə qaldı. Allahın Elçisi – *salləllahu aleyhi va salləm* – dedi: “Şahidlik edirəm ki, Allahdan başqa ibadətə

---

[1] Bunu əl-Buxari “elm” kitabında (1/41), “cihad və siyər” kitabında (3/216) və “libas” kitabında (7/68), Muslim isə “iman” kitabında (rəq: 32) rəvayət etmişdir.

[2] Şəkk edən ravi əl-Aməş’dir. Bax: Səhih Muslim, 1/56

layiq məbud yoxdur və mən onun elçisiyəm. Qul bu iki şəhadətə şəkk etmədən bununla Allaha qovuşarsa, cənnətə (daxil olmasına) mane olunmaz."[3]

Yenə əs-Səhiheyn'də Əbu Zər'dən peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – belə dediyi rəvayət olunur: " - *Lə iləhə illə Allah* – deyib bunun üzərində ölən elə bir qul yoxdur ki, cənnətə daxil olmasın!" Dedim: "Əgər zina edərsə, əgər oğurluq edərsə belə?!" Dedi: "Hətta zina etsə, oğurluq etsə belə!" Bunu üç dəfə təkrarladı, sonra dördüncü dəfə isə dedi: "Əbu Zər'in burnu torpağa batsa belə!" Əbu Zər bu sözləri təkrarlayaraq çıxdı: "Əbu Zər'in burnu torpağa batsa belə!"[4]

"Səhih Muslim"də Ubadə'dən onun ölüm anında belə dediyi rəvayət olunur: Allahın Elçisini – *salləllahu aleyhi va səlləm* – belə deyərkən eşitdim: "Kim Allahdan başqa ibadətə layiq bir məbudun olmadığına və Muhamməlin Allahın Elçisi olduğuna şahidlik edərsə, Allah ona atəşi haram edər."[5]

Yenə "əs-Səhiheyn"də Ubadə'dən peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – belə dediyi rəvayət olunur: "Kim Allahdan başqa ibadətə layiq bir məbudun olmadığına, Tək olduğuna və heç bir şərikinin olmadığına, Muhammədin Onun qulu və elçisi olduğuna, İsanın Allahın qulu və elçisi, Məryəmdə yerləşdirdiyi bir Kəlimə və Ondan gələn bir Ruh olduğuna və Cənnətin haqq, Cəhənnəmin haqq olduğuna şahidlik edərsə, Allah onu etdiyi əməlin dərəcəsinə görə cənnətə daxil edər."[6]

---

[3] Muslim (rəq: 45); Əhməd, "əl-Müsnəd", 3/11

[4] əl-Buxari 7/43; Muslim (rəq: 154); Əhməd, "əl-Müsnəd", 5/166

[5] Muslim (rəq: 47)

[6] əl-Buxari, 4/139; Muslim (rəq: 46)

Şeyx Süleyman bin Abdullah bin Muhamməd bin Abdulvahhab "Təysir əl-Əziz əl-Həmid fi Şərh Kitəb ət-Təvhid" kitabında (səh: 72) deyir: "(Peyğəmbərin) "kim – lə iləhə illə Allah - deyərsə " sözü, yəni, "kim bu sözləri, mənasını bilərək, onun tələblərini batinən və zahirən yerinə yetirərək deyərsə" mənasındadır, necəki Allahu Təalənin sözləri buna dəlalət edir: "**Bil ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur!**" (Muhamməd, 19) və yenə deyir: "**Ancaq** (bunun haqq olduğunu) **bildikləri halda haqqa şəhadət edənlər müstəsnadır.**" (əz-Zuxruf, 86) Amma mənasını bilmədən, tələblərini yerinə yetirmədən sadəcə dildə söyləməyə gəldikdə isə, bu, alimlərin icmasına görə heç bir fayda verməz. Hədisdə buna dəlalət edən dəlil vardır və bu, (peyğəmbərin) "kim şahidlik edərsə" sözləridir, çünki insan bilmədiyi halda necə şahidlik edə bilər?! Bir şeyi sadəcə dildə tələffüz etmək şəhadət adlanmır..." Daha sonra səhifə 78-də deyir: "Kim bu sözləri, mənasını bilərək, şirki tərk etmək, onun ifadə etdiyi mənaya tam qətiyyətlə etiqad etməklə və ona əməl etməklə birlikdə Allahın təkliyini isbat etmək kimi bu kəlimənin tələblərini yerinə yetirərək söyləyərsə, belə biri həqiqi müsəlmandır! Əgər etiqad etmədən sadəcə zahirdə əməl edərsə, belə biri münafiqdir və bunun əksini edən; məsələn şirk edən kəs isə, şəhadəti söyləsə belə kafirdir. Görmürsən ki, münafiqlər zahirən ona əməl etdikləri halda, cəhənnəmin ən alt təbəqəsində yanacaqlar?! Yəhudilər isə şirk və küfr üzərində olduqları halda həmin sözləri söyləyirlər, lakin o sözlər onlara fayda verməmişdir. Eynilə kim şəhadətin tələblərindən və haqqlarından birini inkar edərək mürtəd olarsa, kəlimeyi-şəhadəti yüz min dəfə söyləsə belə ona fayda

## Tövhid əhli atəşə daxil olsa belə orada əbədi qalmaz

Bu barədə gəlmiş hədislər iki növdür:

**Birinci:** Şəhadəti söyləyənlərin Cənnətə daxil olacağı və ya Cənnətdən qadağan olunmayacaqları barədə gəlmiş hədislər. Bu hədislərin mənası aydındır, çünki xalis tövhid əhlindən heç kəs əbədi olaraq cəhənnəmdə qalmayacaqdır və atəşdə günahlarından təmizlənərsə Cənnətə daxil olmaqdan qadağan olunmayacaqlar.

Əbu Zər'in hədisinin mənası budur ki, insanda tövhid olduğu halda zina və oğurluq onun Cənnətə daxil olmasına maneə olmayacaqdır. Bu həqiqətdir, bunda heç bir şübhə yoxdur.[7] Hədisdə, onun tövhid üzərində ölərsə bir gün belə əzab görməyəcəyinə dair bir şey yoxdur.

---

verməz. Yenə eynilə qəbrə və bütlərə ibadət edənlər kimi Allahdan başqasına müxtəlif cür ibadət edənlərə söylədikləri şəhadət kəlimələri fayda verməz və belə kəslər şəhadət kəliməsinin fəziləti haqqında gəlmiş hədislərin və bənzəri hədislərin əhatə dairəsinə daxil deyillər...peyğəmbər – salləllahu aleyhi va səlləm – bunu "tək olduğuna və heç bir şərikinin olmadığına" sözləri ilə izah etmişdir və yəhudilər, münafiqlər və qəbrə ibadət edənlər kimi insanın müşrik olduğu halda bu sözü deyə biləcəyinə diqqət çəkmişdir."

**Tərcüməçi:** Şeyx Abdur-Rahmən əl-Bərrak bu kitabı şərh edərkən Ustaz Sabri'nin müqəddiməsinin izahında bunları deyir: "Dilində "lə iləhə illəllah" deyən, lakin müşriklərdən və onların şirklərindən bəraət etməyən, onların inanclarının batilliyinə və zəlalət olmasına etiqad etməyən kimsə üçün bu sözü sadəcə dil ilə deməkdən başqa heç bir şey düşmür, ona bu kəlimədən heç bir pay düşmür, nə bu sözün tələb etdiyi etiqad baxımından, nə də bu sözün tələb etdiyi əməl baxımından ona heç bir pay düşmür. Əgər iddia edərək müşriklərdən bəraət etdiyini deyərsə, əgər "lə iləhə illəllah" deyib Allahdan başqa heç kəsin ibadətə layiq olmadığına etiqad edərsə və ya iddia edərsə, lakin bununla belə Allaha ibadət etməkdən uzaqlaşarsa, o zaman onun bu təsdiqinin nə mənası olur ki?! Allaha ibadət etməkdən üz döndərmişdir, (ibadətdən) üz döndərməsi onun iddiasını yalanlayır. Allaha ibadət etmir, Allaha itaət etmir, Allahın haramını sadəcə dildə haram sayır, fərzləri yerinə yetirmir, əhəmiyyət vermir; belə biri "lə iləhə illəllah" sözünü həyata keçirməmişdir, haqqını verməmişdir!"

http://www.taimiah.org/Display.asp?ID=2&t=book45&pid=1&f=2twhd00001.htm

[7] Bəli! Bu, həqiqətdir və bunda heç bir şübhə yoxdur, əqidəsində əyrilik olanlardan başqa heç kəs bunu başqa mənaya yozmaz. Əhlis-sünnət val-cəmaə etiqad edir ki, müsəlman biri tövhid üzərində olarsa və heç kəsi Rəbbinə şərik qoşmazsa, bəzi pisliklərdən; məsələn oğurluq, zina, içki içmək və bundan başqa böyük günahlardan uzaqlaşarsa, Allahın istəyi altındadır, dilərsə onu bağışlayar və Cənnətə daxil edər, dilərsə günahlarına görə cəzalandırar və cəhənnəmə daxil edər, sonra onu orada təmizləyər və sonunda varacağı mənzil Cənnət və Allahın – Azzə və Cəllə - rəhməti olacaqdır. Peyğəmbərin – salləllahu aleyhi va səlləm – daha əvvəl qeyd olunmuş "onu etdiyi əməlin dərəcəsinə görə Cənnətə daxil edər" hədisi də bu mənaya uyğun anlaşılmalıdır. Bura küfr və şirkdən aşağı olan böyük günah sahibləri daxildir, lakin

əl-Bəzzar'ın "əl-Müsnəd" əsərində Əbu Hureyrədən mərfu olaraq rəvayət olunur: "Kim – lə iləhə illə Allah – deyərsə, daha əvvəl əzablara düçar olsa belə, bu kəlimə bir gün ona fayda verəcəkdir."[8]

**İkinci:** Atəşə haram olması barədə gəlmiş hədislər. Bəzi alimlər bu hədisləri atəşdə əbədi qalmamaq və ya əbədi qalanların atəşinə daxil olmamaq şəklində yozurlar və bu, (yəni əbədi qalanların atəşi) cəhənnəmin üst qatı istisna olmaqla digər qatlardır, çünki müvahhidlərdən asi olmuş bir çox kəs günahlarına görə cəhənnəmin üst qatına girəcək. Daha sonra isə şəfaət edənlərin şəfaəti və rəhimlilərin Ən Rəhimlisinin rəhməti ilə oradan çıxarılacaqlar.

"əs-Səhiheyn"də rəvayət olunur: "Allahu Təalə deyir: "İzzətimə və Cəlalıma and olsun ki, "lə iləhə illə Allah" deyənləri atəşdən çıxaracağam."[9]

---

küfr və şirk sahibini Allah heç zaman Cənnətə daxil etməyəcək, çünki Allah Cənnəti kafirlərə haram etmişdir və Cənnətə müsəlman nəfsdən başqa heç kəs daxil olmayacaq.

əl-İmam ən-Nəvəvi – rahiməhullah – "Səhih Muslim"ə yazdığı şərhində (1/217) deyir: "Bil ki, əhli-sünnətin məzhəbi və həm sələfdən, həm də xələfdən olan haqq əhlinin görüşü budur: kim müvahhid olaraq ölərsə istənilən halda Cənnətə daxil olacaqdır. Uşaq, dəli kimi günahdan təmiz olan, yetkin yaşında dəli olmuş kəs, şirkdən və digər günahlardan səhih bir tövbə ilə tövbə etmiş və tövbəsindən sonra günah etməmiş kəslər və ümumiyyətlə günaha bulaşmamış xoşbəxt kəslər; bütün bu siniflər Cənnətə daxil olacaqlar, cəhənnəmə əslən girməyəcəklər. Lakin onlar (cəhənnəmə) varid olmaq haqqındakı məşhur ixtilafa əsasən ora varid olacaqlar. Doğru görüş budur ki, cəhənnəmə varid olmaqla qəsd olunan, sirat körpüsündən keçməkdir və bu körpü cəhənnəmin üzərində durur. Allah bizi bundan və digər şərlərdən qorusun! Lakin böyük günahı olan və tövbə etmədən ölmüş kəsə gəldikdə isə, belə biri Allahu Təalənin diləyi altındadır. Diləsə onu bağışlayar və Cənnətə daxil edərək ilk qismdəki kəslərdən edər, diləsə - Subhənəhu va Təalə - istədiyi miqdarda cəzalandırar, sonra Cənnətə daxil edər. Günah işləsə belə tövhid üzərində ölən bir kəs atəşdə əbədi qalmayacaqdır, eynilə xeyir əməl etsə belə küfr üzərində ölən kəs cənnətə daxil olmayacaqdır. Bu, haqq əhlinin bu məsələdəki görüşünü bir arada cəm edən qısa bir izahdır. Kitab və sünnətin dəlilləri və ümmətin icması bu qaydanı dəstəkləməkdədir, bu barədə təvatür olaraq qəti elm ifadə edən nasslar varid olmuşdur. Bu qayda isbat olunduqdan sonra, bu mövzuda gəlmiş hədislərin hamısı və digər hədislər bu qaydaya əsasən anlaşılmalıdır. Əgər zahirində ziddiyət olan bir hədis varid olarsa, şəriətin nasslarının arasını cəm etmək məqsədilə həmin hədisi bu qaydaya əsasən təvil etmək lazımdır."

[8] əl-Bəzzar "əl-Müsnəd"də (1/3), əl-Beyhəqi "Şuab əl-İman"da (1/268-269; rəq: 96), ət-Tabərani "əl-Mucəm əs-Sağir"də (rəq: 394) rəvayət etmişdir. əl-Heysəmi "əl-Məcmə"də (1/22) deyir: "Bunu əl-Bəzzar və ət-Tabərani "əl-Əvsat" və "əs-Sağir" kitablarında rəvayət etmişdir. Raviləri "əs-Sahih"in raviləridir."

[9] əl-Buxari, 8/202; Muslim (rəq: 326)

# Şəhadət kəlimənsinin şərtləri

Alimlərdən bir qrup isə deyir ki, bu hədislərlə qəsd olunan budur ki, "lə iləhə illə Allah" Cənnətə girməyin və atəşdən qurtulmağın səbəbidir və bunu tələb edir. Lakin şərtlər yerinə yetmədən və maneələr aradan qalxmadan tələblər keçərli sayılmaz. Şərtlərdən birinin yerində olmamasına görə və ya hər hansı bir maneənin mövcud olmasına görə tələb öz vəzifəsini itirmiş olur və bu, əl-Həsən[10] və Vəhb ibn Munəbbəh'in[11] görüşüdür. Doğru olan da bu görüşdür.[12]

əl-Fərazdəq[13] həyat yoldaşını dəfn edərkən əl-Həsən ona dedi: "Bu günə nə hazırlamısan?" Dedi: "Yetmiş ildən bəri "lə iləhə illə Allah" şəhadətini." əl-Həsən dedi: "Bəli, "lə iləhə illə Allah" şəhadətinin şərtləri vardır[14]. İffətli qadınlara ləkə yaxmaqdan əl çək!"

---

[10] **Tərcüməçi:** Böyük tabii, Əbu Said əl-Həsən bin Yəsar əl-Basri; imam, zahir, şücaət nümunəsidir. Hicri 21-ci ildə Mədinə şəhərində dünyay gəlmişdir. Hicri 110-cu ildə isə Basra şəhərində vəfat etmişdir. Kitablar onun sözləri və xəbərləri ilə doludur.

[11] **Tərcüməçi:** Vəhb bin Munəbbih əl-Əbnəvi əs-San'ani; əslən fars millətindəndir. Tabiin nəslindən sayılır. Tarixçidir, israiliyyatdan çoxlu rəvayətləri vardır. Yəməndə hicri 20-ci ildə doğulmuş və orada hicri 110-cu ildə vəfat etmişdir.

[12] **Tərcüməçi:** Şeyx Abdur-Rahmən əl-Bərrak bu sözlərin şərhində deyir: "Müəllif deyir ki, bu görüş səhihdir və bu görüşü əl-Həsən əl-Basri və Vəhb bin əl-Munəbbih'ə nisbət etmişdir. Həqiqətdə bu görüşü onlara nisbət etmək bu görüşün yalnız bu iki alimə məxsus olması anlamına gəlməz, lakin onlardan bu barədə əsərlərin gəldiyini göstərir."

http://www.taimiah.org/Display.asp?pid=1&t=book45&f=2twhd00004.htm

[13] **Tərcüməçi:** əl-Fərazdəq'in adı Hummən bin Ğalib bin Sasaə bin Naciyə ət-Təmimi əl-Basri'dir. Əsrinin şairidir. Hicri 110-cu ildə vəfat etmişdir. (bax: "Siyər Əaləm ən-Nubələ", 4/590)

əl-Fərazdəq həyasız bir şair olmuşdur. İnsanları ələ salar və şerlərində qadınlara söz atar, onlara sataşarmış. Buna görə də müasirlərindən bəziləri ona "İffətli qadınlara ləkə atdığına görə Allahdan qorxmursan?" deyərək onu danlayardılar. (bax: İbn Kəsir, "əl-Bidayə van-Nihayə", 9/299)

[14] əl-Hafiz Əhməd əl-Həkəmi – rahiməhullah – bunu gözəl şəkildə bir neçə beytdə nəzmə almışdır və orada tövhid kəliməsinin şərtlərini qeyd etmişdir. Bu şərtlərin haqqını verməyən kəsə tövhid kəliməsi fayda verməz. Həqiqətdə bütün bu şərtlər Allahın Elçisindən – salləllahu aleyhi va sələm – varid olmuş hədislərdə mövcuddur. O, - rahiməhullah – deyir:

وبشروط سبعة قد قيّدتْ　　وفي نصوص الوحي حقاً وردتْ

Yenə ondan rəvayət olunur ki, o, əl-Fərazdəq'ə belə demişdir: “Bu, (çadırın) dirəyidir, bəs (çadırı bərkidən) iplər hardadır?”

---

**فإنه لم ينتفع قائلها   بالنطق إلا حيث يستكملها**

**العلم واليقين والقبول   والانقياد فادْر ما أقول**

**والصدق والإخلاص والمحبة   وفّقك الله لما أحبه**

**Şəhadət kəliməsi yeddi şərtlə şərtlənib,**

**Bu şərtlər vəhy dəlillərində haqq ilə varid olub.**

**Şərtləri ödəmədən sadəcə dildə söyləməklə,**

**Bu söz fayda verməz deyən kəsə qətiyyətlə!**

**(Şərtlər budur) Mənasını bilmək, yəqin olmaq və qəbul etmək,**

**itaət etmək də şərtdir, yaxşı anla!**

**Sidq, ixlas və sevgi də şərtlərdəndir!**

**Allah səni xoş gördüyünə müvəffəq etsin!**

Bu, peyğəmbərin – salləllahu aleyhi va səlləm – hədislərindən götürülmüşdür və bu hədislərdən bəzisində gəlir: “Kim ixlasla “lə iləhə illə Allah” deyərsə...”, digər hədisdə: “yəqinliklə...”, bəzi rəvayətlərdə “qəlbində və dilində təsdiq edərək...”, bəzi hədislərdə isə “səmimi qəlblə deyərsə...”, digər rəvayətlərdə isə “dili bu sözlə boyun əymiş olaraq, qəlbi bu sözlə razı olmuş olaraq...” şəklində gəlmişdir. Müəllif – rahiməhullah – bu hədisləri zikr etmişdir və qarşıda gələcəkdir.

Biz adı keçmiş bu yeddi şərtə səkkizinci şərti də əlavə edə bilərik. Bu, Allahdan başqa ibadət olunan şeylərə küfr etməkdir və bu, İmam Muslim'in “iman” fəslində (rəq: 37) rəvayət etdiyi peyğəmbərin – salləllahu aleyhi va səlləm –hədisində varid olmuşdur. Hədisdə gəlir: “Kim “lə iləhə illə Allah” deyərsə və Allahdan başqa ibadət olunan şeylərə küfr edərsə, malı və qanı haram olar və hesabı Allaha aiddir.”

Şeyxul-İslam Muhamməd bin Abdulvahhab – rahiməhullah – deyir: “Bu, “lə iləhə illə Allah” kəliməsinin mənasını izah edən dəlillər içində ən əzəmətlisidir, çünki bu, sadəcə şəhadət kəliməsini söyləməyi, qanı və malı qoruyan amillərə aid etməmişdir. Hətta tələffüz etməklə birlikdə mənasını bilsə, hətta bunu təsdiq etsə, üstəlik şəriksiz Allahdan başqa heç kəsə dua etməsə belə, yenə qanı və malı qorunmuş sayılmır, gərək mütləq Allahdan başqa ibadət olunan şeylərə küfr etməyi də bu şərtlərə əlavə etmək lazımdır. Çünki şəkk və tərəddüd onun malını və qanını haram etmir. Bundan da üstün məsələ varmı?! Bundan da aydın bir izah varmı?! Qarşı çıxan tərəf üçün bundan da qəti bir dəlil varmı?!” (“Təysir əl-Aziz əl-Həmid”, səh: 147)

əl-Həsən'dən soruşurlar: "İnsanlar soruşurlar ki, "lə iləhə illə Allah" deyən kəs Cənnətə daxil olacaqmı?" Cavabında buyurmuşdur: "Kim "lə iləhə illə Allah" deyərsə, haqqını və fərzlərini ödəyərsə Cənnətə daxil olacaqdır."

"Məgər "lə iləhə illə Allah" Cənnətin açarı deyilmi?" deyərək soruşan bir kəsə Vəhb bin Munəbbəh belə cavab vermişdir: "Bəli! Lakin bütün açarların dişləri vardır və əgər dişləri olan açarla gəlsən, (Cənnətin qapıları) sənin üçün açılacaq, əks təqdirdə açılmayacaq."[15]

"Lə iləhə illə Allah" Cənnətin açarıdır"[16] hədisini İmam Əhməd munqati[17] isnadla rəvayət etmişdir.

Muaz'dan rəvayət olunur: "Allahın Elçisi – salləllahu aleyhi va səlləm – mənə dedi: "Yəmənin əhalisi səndən Cənnətin açarı barədə soruşsa de: "Allahdan başqa ibadətə layiq məbud olmadığına şahidlik etmək."

Bu görüşün səhihliyini göstərən dəlillərdən biri də budur ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – bir çox hədislərdə Cənnətə daxil olmağı saleh əməllərdən sonra qeyd etmişdir. "əs-Səhiheyn"də Əbu Əyyub'dan rəvayət olunduğu kimi bir nəfər deyir: "Ey Allahın Elçisi! Məni Cənnətə daxil edəcək bir əməl haqqında mənə məlumat ver!" Dedi: "Allaha ibadət et və Ona heç bir şərik qoşma! Namaz qıl, zəkatı ödə və qohumluq əlaqələrini gözlə!"[18]

"Səhih Muslim"də isə Əbu Hureyrə'dən rəvayət olunan hədisdə bir nəfər soruşur: "Ey Allahın Elçisi! Onu etməklə Cənnətə daxil olacağım bir əmələ yönəlt məni!" Dedi: "Allaha ibadət et və Ona heç bir şeyi şərik qoşma! Vacib buyurulmuş namazları qıl, fərz olan zəkatı ver və Ramazan ayını oruc tut!" Həmin şəxs dedi: "Nəfsimi əlində tutana and içirəm ki, buna heç bir şey əlavə etməyəcəm və bundan heç bir şey əksiltməyəcəm." Peyğəmbər – salləllahu aleyhi va səlləm – dedi: "Kim Cənnət əhlindən birini görmək istərsə, bu kimsəyə baxsın!"[19]

"əl-Müsnəd" əsərində isə Buşeyr bin əl-Xasasiyyə'dən belə dediyi rəvayət olunur: Peyğəmbərə - salləllahu aleyhi va səlləm – beyət etmək üçün onun yanına gəldim. Mənə "lə iləhə illə Allah və Muhamməđur-Rasulullah" şəhadətini, namaz qılmağı, zəkat verməyi, İslam həcci ilə həcc etməyi, Ramazanda oruc tutmağı və Allah uğrunda cihad etməyi şərt

---

[15] əl-Buxari (3/109) bunu mualləq olaraq rəvayət etmişdir, lakin "ət-Tarix əl-Kəbir"də (1/95) tam sənədlə rəvayət edir. Bunu eləcədə Əbu Nueym "əl-Hilyə" əsərində (1/66) rəvayət etmişdir.

[16] Əhməd "əl-Müsnəd" (5/242) və hədisin sənədi müəllifin – rahiməhullah - dediyi kimidir. əl-Heysəmi "Məcmə əz-Zəvaid"də (1/21) deyir: "Bunu Əhməd və Bəzzar rəvayət etmişdir və bunda (yəni sənədində) Şəhr və Muaz arasında inqita (qopuq) vardır. Üstəlik İsmayıl bin Əyyaş'ın Hicaz əhlindən rəvayətləri zəifdir və bu, həmin rəvayətlərdən biridir."

[17] **Tərcüməçi:** "Munqati", yəni qopuq, qırıq anlamındadır. Bu, sənədində bir və ya iki ravinin çatışmadığı sənədə deyilir. Belə hədislər zəifdir və dəlil üçün yararsızdır.

[18] əl-Buxari, 2/108-109

[19] əl-Buxari, 2/109; Muslim (rəq: 15)

qoşdu. Dedim: “Ey Allahın Elçisi! Bu ikisinə gücüm çatmaz; cihad və sədəqə.” Allahın Elçisi – salləllahu aleyhi va səlləm – onun əlindən tutdu, sonra silkələdi və dedi: “Nə cihad, nə də sədəqə!!! O zaman nə ilə Cənnətə girəcəksən?” Dedim: “Ey Allahın Elçisi! Sənə beyət edirəm.” Bunların hamısında ona beyət etdim.”[20]

---

[20] Əhməd, “əl-Müsnəd”, 5/224

əl-Heysəmi “Məcmə əz-Zəvaid”də (1/47) deyir: “Bunu Əhməd və ət-Tabərani “əl-Kəbir” və “əl-Əvsat”da rəvayət etmişdir. Hədisin ləfzi ət-Tabərani’yə aiddir. Əhmədin rəvayətindəki ravilər siqadır.”

əl-Hakim hədisi səhih saymış və əz-Zəhəbi onunla razılaşmışdır; (2/80) deyir: “Bu, isnadı səhih bir hədisdir və onlar (Buxari və Muslim) bunu rəvayət etməyiblər.Bişr bin əl-Xasasiyyə ənsar arasından səhabəlikdə qeyd olunanlardan biridir: radiyallahu anhu.

## Cənnətə daxil olmağın şərtləri

Bu hədis göstərir ki, tövhid, namaz, oruc və həccin hasil olması ilə birlikdə cihad və sədəqə Cənnətə daxil olmaq üçün bir şərtdir.[21]

Bunun bir bənzəri də budur ki, peyğəmbər – *salləllahu aleyhi va səlləm* –"Allahdan başqa ibadətə layiq məbud olmadığına və Muhəmmədin Allahın Elçisi olduğuna şahidlik edənə qədər insanlara qarşı vuruşmaqla əmr olundum"[22] demişdir, bununla da Ömər və bir qrup səhabə belə anlayırdılar ki, şəhadət kəlimələrini söyləyən kəs bu sözlərlə dünya cəzasından qurtulmuş olur və buna görə də zəkatı verməkdən boyun qaçıran kəslərə qarşı döyüşməkdən çəkinirdilər.[23] Lakin əs-Siddiq isə anlamışdı ki, onlara qarşı vuruşmaq yalnız

---

[21] Bu, haqqdır və bunda heç bir şübhə yoxdur. İnsanların qəlbinə şübhə salan cədəl əhlindən başqa heç kəs bunda mübahisə etməz.. Şəhadətin şərtlərini yerinə yetirməsə və tələblərini ödəməsə belə, hətta açıq aydın şəhadəti pozmasına dair əlimizdə Allahdan dəlil olan əməlləri etsə belə, Cənnətə daxil olmağı və atəşdən qurtulmağı yalnız şəhadət kəliməsi ilə məhdudlaşdıran kəslərin halı nədir?! Onlara deyilən sözü başqası ilə dəyişdirdilər. Zülm edənlər isə hansı dönüşə dönəcəklərini mütləq biləcəklər!

[22] əl-Buxari, 2/110; Bu ləfzlə rəvayət etmişdir: **"Lə iləhə illə Allah" deyənə qədər insanlara qarşı vuruşmaqla əmr olundum. Kim bunu deyərsə, haqqı istisna olmaqla malını və canını məndən qorumuşdur. Hesabı Allaha aiddir.**"

[23] İmam ən-Nəvəvi – rahiməhullah – zəkat verməyənlərin təkfir edilməməsi görüşünə üstünlük vermişdir və onları üsyankarlar (əhlul-bəğy) qəbilinə aid etmişdir. ("Şərh alə Səhih Muslim", 1/204) Lakin onlarla sonrakı əsrlərdə zəkat verməyənlər arasında hökmdə fərq qoymuşdur. O, - rahiməhullah – deyir (1/205):

"Əgər soruşsalar ki, "zəkatdan boyun qaçıranları qəbul etdiyin vəchə uyğun necə təvil edirsən və onları necə üsyankar (əhlul-bəğy) sayırsan? Əgər zamanımızda müsəlmanlardan bir qrup zəkatın fərz olmasını inkar etsələr və onu ödəməkdən boyun qaçırsalar, onların da hökmü üsyankar olacaqmı?" Belə cavab veririk: Xeyr! Bizim bu zamanımızda zəkatın fərz olmasını inkar edən kəs müsəlmanların icması ilə kafirdir. Onlarla bu kəslər arasındakı fərq budur ki, onlar bizim bu zamanımızda baş verməyən bəzi səbəblər və məsələlərə görə üsrlü sayılırlar. Onların yaşadığı zamanın, hökmlərin nəsx ilə dəyişdiyi şəriət dövrünə yaxın olması, onların dini məsələlərdən cahil olmaları, İslamda yeni olmaları bu səbəblərdən bəziləridir və onlar şübhəyə düşmüşlər, buna görə də üzrlü sayılırlar. Lakin bizim zamanımızda isə İslam dini yayılmışdır və müsəlmanlar arasında zəkatın vacib olması elmi elə çoxalmışdır ki, həm xüsusi təbəqə, həm də avam kütlə bundan xəbərdardır. Alim və cahil bu elmdə şərik olmuşdur. Heç bir kəs (zəkatı) inkar etməkdə etdiyi təvilə görə üzrlü sayılmaz. Ümmətin üzərində icma etdiyi dini məsələlərdən hər hansı birini - əgər beş vaxt namaz, Ramazan ayı oruc tutmaq, cənabətdən qüsl almaq, zinanın, alkoholun, məhrəmlərlə evlənməyin haram olması və buna bənzər hökmlər kimi elmi geniş yayılmış məsələlərdən olarsa - inkar edənin hökmü də bunun kimidir. Yalnız İslamda yeni olması və həddlərdən xəbərsiz olması halı istisnadır, belə bir halda cahilliyi səbəbi ilə

şəhadətin haqqının ödənildiyi halda qadağan olur. Çünki peyğəmbər – *salləllahu aleyhi va səlləm* – demişdir: "Əgər bunu eləsələr qanlarını və mallarını məndən qorumuş olurlar. Lakin onların haqqını verməmək halı istisnadır." Dedi: "Zəkat malın haqqıdır."

əs-Siddiq'in anladığı budur və səhabədən bir qrup; İbn Ömər, Ənəs və bu ikisindən başqaları peyğəmbərdən – *salləllahu aleyhi va səlləm* – belə dediyini rəvayət etmişlər: "Allahdan başqa ibadətə layiq məbud olmadığına, MuhamməDin Allahın Elçisi olduğuna şahidlik edib, namaz qılıb, zəkat verənə qədər insanlara qarşı vuruşmaqla əmr olundum."

Buna Allahu Təalənin bu sözləri şahidlik etməkdədir: "**Lakin tövbə etsələr**[24]**, namaz qılıb zəkat versələr, onları sərbəst buraxın!**"[25] Necəki Allahu Təalənin: - "**Əgər tövbə etsələr, namaz qılıb zəkat versələr, onlar sizin din qardaşlarınızdır.**"[26] – sözləri dəlalət edir ki, din qardaşlığı yalnız tövhidlə birlikdə fərzlərin yerinə yetirilməsi ilə sabit olur və şirkdən tövbə etmək yalnız tövhid ilə hasil olur.

Əbu Bəkr səhabələrə bunu bəyan etdikdə, səhabələr onun görüşünə yönəldilər və onun görüşünü doğru saydılar.

Dünyadakı aqibətin mütləq şəkildə şəhadət kəliməsini söyləyən kimsənin üzərindən qalxmayacağı, üstəlik İslamın haqlarından hər hansı bir haqqı pozması ilə cəzalanacağı bilinərsə, o zaman Axirətdəki aqibət də bunun kimidir.

Əvvəldə zikr olunan hədislər və eyni mənada olan hədislər, bir qrup alimə görə fərzlər və hüdudlar nazil olmamışdan əvvəlki dövrə aiddir. əz-Zuhri[27] və əs-Səvri[28] və digərləri bu

---

bunlardan birini inkar edərsə, kafir olmaz. Belələrinin halı da din adının (yəni İslam hökmünün) haqqlarında qalmasında, onların (zəkatdan boyun qaçıranların) halı ilə eynidir. Lakin qadını bibisi və xalası üzərinə nikahlamaq, qəsdən qətl edənə miras düşməməsi, nənəyə mirasın altıda birinin aid olması və buna bənzər hökmləri kimi haqqında icma olduğu xüsusi elm yolu ilə bilinən məsələlərə gəldikdə isə, bunları inkar edən kəs kafir olmaz, əksinə bu növ elmlərin adi insanlar arasında geniş yayılmaması səbəbi ilə üzrlü sayılar."

[24] "**Əgər tövbə etsələr**...", təfsir alimlərindən böyük bir qrup bu ayənin təfsirində demişlər: "yəni; şirkdən tövbə etsələr, eləcədə deyilmişdir ki, onların tövbələri bütləri tərk edib, Rəbblərinə ibadət etməkdir. Yenə deyilmişdir: əgər Allaha şərik qoşmaqdan və Muhammədin peyğəmbərliyini inkar etməkdən əl çəkib Allahın tövhidinə və ona ixlasla ibadət etməyə üz tutsalar. Həm də küfrdən tövhidə dönüş olduğu deyilmişdir.

[25] ət-Tövbə, 5

[26] ət-Tövbə, 11

[27] **Tərcüməçi:** Əbu Bəkr Muhamməd bin Abdilləh bin Ubeydilləh əz-Zuhri əl-Mədəni; məşhur alim fəqihlərdən biridir. İbn Teymiyyə deyir: "əz-Zuhri yetmiş ilə yaxın müddətdə İslamı qorumuşdur." Hicri 124-cü ildə səksən dörd yaşında vəfat etmişdir.

[28] **Tərcüməçi:** Sufyan bin Said əs-Səvri; "hədis elmində möminlərin əmiri" ləqəbi ilə tanınmışdır, elm və əməl baxımından seyyidlərdən biri olmuşdur. Hicri 160-cı ildə vəfat etmişdir.

alimlərdəndir. Belə bir görüş (haqdan) çox uzaqdır[29], çünki həmin hədislərin çoxu, Mədinədə fərzlər və hüdudların nazil olmasından sonrakı dövrə təsadüf edir. Bu hədislərdən bəzilərində isə bunun Təbuk döyüşündə deyildiyi qeyd olunur və bu, peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – həyatının son zamanlarıdır.

Onlardan bəziləri isə bu hədislər haqqında, onların mənsux olduğunu deyir[30]. Onlardan bəziləri də bu hədislərin möhkəm olduğunu deyir, lakin onlara bəzi şərtlər əlavə edirlər. Bu, nassa əlavə olunmuş ziyadənin nəsx olub olmaması məsələsi ətrafında dövr edir və bu məsələdəki ixtilaf usul alimləri arasında məşhurdur.

əs-Səvri və digərləri açıq şəkildə bu hədislərin mənsux olduğunu və onların, fərzlər və hüdudlarla nəsx olunduğunu demişdir. Ola bilsin ki, onlar "nəsx" dedikdə bununla bəyan və izahı qəsd edirlər, çünki sələf, bənzəri hallarda çox zaman "nəsx" sözünü işlədiblər. Beləliklə onların məqsədi budur ki, Cənnətə daxil olmaq və atəşdən qurtulmağın fərzləri etmək və haramlardan uzaqlaşmaq şərtinə bağlı olması, fərz və hüdud ayələri ilə izah olunmuşdur. Bununla da bu naslar nəsx olunmuşdur, yəni izah olunmuş, təfsir olunmuşdur. Bunları nəsx edən isə fərz və hüdud naslarıdır, yəni bu hədislərin mənasını təfsir etmiş, onları izah etmişdir.

---

[29] İmam ən-Nəvəvi – rahiməhullah - əl-Qadi İyad'dan – rahiməhullah - nəql edərək deyir (1/219) : "Sələfdən bir qrup alimdən – rahiməhum Allah - rəvayət olunmuşdur ki, bu hədislər fərzlərin, əmr və qadağaların nazil olmasından əvvəlki dövrə aiddir və İbnul-Musayyəb bu görüşdə olan alimlərdən biridir. Alimlərdən bəziləri isə deyir: Bu hədislər mucməldir (mənası açıqdır, izah olunmamışdır) və şərhə möhtacdır. Bu hədislərin mənası budur ki, kim şəhadət kəliməsini söyləyər və bu kəlimənin haqqlarını ödəyər və fərzləri yerinə yetirərsə. Bu, əl-Həsən əl-Basri'nin görüşüdür. Bəzi alimlər isə bu hədislərin, peşman olduqda deyib sonra ölən kəslərə aid olduğunu demişdir və bu, əl-Buxari'nin görüşüdür. Bütün bu təvillər, hədislərin zahiri mənalarına görə yozulduğu halda deyilmişdir. Lakin hamısını öz yerinə qoyduqda muhaqqiq alimlərin izah etdiyi kimi təvillərində heç bir problem qalmır." Sonra (1/220) deyir: "İbnul-Musayyəb'dən və digərlərindən rəvayət olunan görüşə gəldikdə isə, bu görüş zəif və batildir, çünki bu hədisləri rəvayət edən ravilərdən biri Əbu Hureyrə'dir – radiyallahu anhu – və o, sonradan İslamı qəbul etmişdir. O, alimlərin ittifaqı ilə hicri yeddinci ildə Xeybərdə müsəlman olmuşdur və artıq şəriət hökmləri bərqərar olmuşdu və bu vaciblərin çoxunun fərzliyi bərqərar olmuşdu."

[30] İmam əş-Şəvkani – rahiməhullah – "Fəthul-Qadir" adlı təfsirində (1/197) deyir: "İbn Cərir deyir: "Biz hər hansı bir ayəni ləğv edir..." (əl-Bəqara, 106) yəni bir ayənin hökmünü başqa hökmə köçürürük, hökmünü əvəz edir, onu dəyişirik. Beləki halalı harama, haramı halala, mübahı qadağaya, qadağanı mübaha çeviririk və bu, nəhy, qadağa, itlaq, mübahlıq məsələlərində olur. Xəbərlərə gəldikdə isə, onlarda nə nasix, nə də mənsux yoxdur."

Deyirəm: buna əsasən bu hədislərdə nəsx iddiası qəbul deyildir, səhih deyildir, çünki bu hədislər xəbərlərlə əlaqəlidir, əmr, nəhy və halal, haramla əlaqəli deyildir.

## Mütləq nasları muqayyəd nasların işığında anlamaq

Alimlərdən bir qrup isə demişdir ki, bu hədislər mütləqdir və digər hədislərdə muqayyəd[31] olaraq gəlmişdir. Bu hədislərdən birində deyilir: "Kim ixlasla "lə iləhə illə Allah" deyərsə..."[32] Bir başqa rəvayətdə isə deyir: "yəqinliklə bilərsə..."[33] və bir başqasında isə deyir: "qəlbi dilini təsdiqləyərsə..."[34], bir başqa rəvayətdə isə deyir: "qəlbdən səmimi olaraq deyərsə..."[35] və yenə başqa rəvayətdə deyir: "dili bu sözlə acizliyini hiss edərək, qəlbi isə bununla xatircəm olaraq deyərsə..."[36]

---

[31] **Tərcüməçi:** "Mütləq" və "muqayyəd" usul elmində xüsusi bir mövzudur. Oxuyucular üçün bunu burada qısa izah etmək istəyirəm ki, alimin qəsdini anlaya bilsinlər. Mütləq mənaya belə bir misal vermək olar: Əgər kimsə sizə "Bir tələbəyə kitab hədiyyə et!" deyərsə, bu cümlənin mənası mütləqdir. Yəni istənilən tələbəyə kitab hədiyyə etməklə onun tələbini yerinə yetirmiş olursan və bu tələbə, istənilən bir tələbə ola bilər, ona görə də buna "mütləq" deyilir. Lakin əgər sizdən "Bir azərbaycanlı tələbəyə hədiyyə verməyi" tələb edərsə, o zaman onun bu tələbi muqayyəddir. Yəni, artıq istənilən tələbəyə hədiyyə verməklə tələbi yerinə yetirilmiş sayılmaz, çünki sizə tələbənin azərbaycanlı olmasını şərt qoşmuşdur. Artıq sözünə bir şərt, yəni bir qeyd əlavə etmişdir. Ona görə də buna "muqayyəd" tələb deyilir.

[32] Bunu Əhməd "əl-Müsnəd" əsərində (5/236) Amr bin Dinar'dan rəvayət edir. Dedi: Cabir bin Abdullahı belə deyərkən eşitdim: Muaz ölüm ayağında olarkən onun hüzurunda olan mən idim. Dedi: "Boynumdakı örtüyü açın ki, sizə Allahın Elçisindən – salləllahu aleyhi va səlləm – eşitdiyim bir hədisi danışım!" - bir başqa yerdə deyir: "Allahın Elçisindən – salləllahu aleyhi va səlləm – eşitdiyim bir şeyi sizə xəbər verim!" – "Yalnız tənbəlləşməyinizdən qorxmam bunu danışmaqdan məni çəkindirir. Onu belə deyərkən eşitdim: "Kim qəlbində ixlasla və ya qəlbində yəqinliklə Allahdan başqa ibadətə layiq məbud olmadığına şahidlik edərsə, atəşə girməz və ya Cənnətə daxil olacaqdır." Bir başqasında deyir: "Cənnətə daxil olar və atəş ona toxunmaz."

əl-Heysəmi "Məcmə əz-Zəvaid"də (1/22) deyir: "Bunu əl-Bəzzar rəvayət etmişdir, raviləri siqadır. Yalnız əl-Bəzzarın onlardan rəvayət etdiyi iki nəfərin tərcümeyi halını tapa bilmədim..." Bunu eləcədə əl-Humeydi "əl-Müsnəd"də (1/181; rəq:369), ət-Tabərani "əl-Kəbir"də (rəq: 63) və "Məvarid əz-Zaman"da (rəq: 4) gəldiyi kimi İbn Hibban rəvayət etmişdir.

[33] Muslim (rəq: 52, 31) bunu Əbu Hureyrədən rəvayət edir: Dedi: Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Ey Əbu Hureyrə!" və mənə ayaqqabılarını verdi və dedi: "Mənim bu cüt ayaqqabılarımı götür get! Bu divarın arxasında yəqinliklə bilib "lə iləhə illə Allah" deyərək şahidlik edən biri ilə qarşılaşsan, onu Cənnətlə müjdələ!" Bunu eynilə əl-Beyhəqi "Şuab əl-İman" kitabında (rəq: 5) rəvayət etmişdir.

[34] Əhməd "əl-Müsnəd" əsərində (2/307) Əbu Hureyrədən rəvayət etmişdir ki, o, Allahın Elçisindən – salləllahu aleyhi va səlləm – soruşdu: "Rəbbin şəfaət barədə sənə nə cavab verdi?" Dedi: "Muhammədin nəfsini əlində tutana and olsun! Ümmətim arasında məndən bunu soruşanın ilk sən olacağını bilirdim, çünki sənin elmə olan həvəsini görürdüm. Muhammədin nəfsini əlində tutana and olsun ki, onların cənnət qapılarından asılmaları məni çox qayğılandırır və bu, mənim üçün şəfaətimin hamısından daha

Bütün bunlar qəlbin əməllərinə, onun şəhadətin mənasının haqqını verdiyinə işarə edir, "lə iləhə illəllah" sözünün haqqını vermək isə qəlbin Allahdan başqasını məhəbbətdə, ümiddə, qorxuda, təvəkküldə, istianədə[37], boyun əyməkdə, tövbədə və istəkdə ilahiləşdirməməsidir. "Muhammədən Rasulullah" sözünün haqqını vermək isə Allahın Muhammədin – salləllahu aleyhi va səlləm – dili ilə göndərdiyi şəriətdən başqası ilə Allaha ibadət etməməkdir.

Bu məna aşkar şəkildə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – mərfu olaraq gəlmişdir; o, demişdir: "Kim ixlas ilə "lə iləhə illəllah" deyərsə Cənnətə daxil olar!" Soruşdular: "Bunun ixlası necə olur, ey Allahın Elçisi?" Dedi: "Allahın sənə haram etdiyi hər şeydən səni çəkindirməsi ilə olur."[38]

---

əhəmiyyətlidir. Şəfaətim isə qəlbi dilini, dili isə qəlbini təsdiqlədiyi halda ixla ilə "lə iləhə illəllah" deyən kəsə aiddir."

əl-Heysəmi "əl-Məcmə"də (10/407) deyir: "Bunu Əhməd rəvayət edib və Muaviyə bin Mu'attib'dan başqa ravilərinin hamısı"əs-Sahih"in raviləridir, o isə (yəni Muaviyə) siqadır."

[35] Əhməd "əl-Müsnəd"də (1/63) Osman bin Affan'dan – radiyallahu anhu – rəvayət edir; dedi: "Allahın Elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Mən elə bir söz bilirəm ki, bir qul onu qəlbdən səmimi olaraq dediyi halda cəhənnəm ona haram olar." Ömər bin əl-Xattab – radiyallahu anhu – dedi: "Mən bunun nə olduğunu deyimmi? Bu, ixlas kəliməsidir ki, Allah Təbərakə və Təalə Muhammədi – salləllahu aleyhi va sələm – və onun səhabələrini onunla izzətləndirmişdir. Bu, təqva kəliməsidir ki, Allahın peyğəmbəri – salləllahu aleyhi va səlləm - əmisi Əbu Talib ölüm ayağında olarkən onun üzərində təkid etmişdi. Bu, "lə iləhə illəllah" şəhadətidir."

əl-Heysəmi "əl-Məcmə"də (1/20) deyir: "Deyirəm: Ömərə aid İbn Macə'nin rəvayət etdiyi bir başqa hədis də vardır, lakin bu kontekstdən fərqlidir və raviləri siqadır. Bunu Əhməd rəvayət etmişdir." Bunu İbn Hibban rəvayət etmişdir, necəki "Məvariduz-Zaman"da 1 rəqəmi ilə qeyd olunub. əl-Hakim "əl-Müstədrək"də (1/72) deyir: bu hədis əl-Buxari və Muslim'in şərtinə görə səhihdir, lakin onlar nə bu ləfz ilə, nə də bu isnad ilə rəvayət etməyiblər.

[36] Abdullah bin Əbi Qatədə'dən, o da atasından rəvayət edir; dedi: "Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Kim Allahdan başqa haqq məbudun olmadığına və Muhammədin Allahın elçisi olduğuna şahidlik edər, bu sözlə dili acizliyini hiss edərsə və qəlbi xatircəm olarsa, atəş onu yeməz!" əl-Beyhəqi bunu "əş-Şuab"da (rəq: 9) rəvayət edir.

əl-Heysəmi "əl-Məcmə"də (1/26) deyir: "Sad bin Ubədə'dən; dedi: "Peyğəmbər – salləllahu aleyhi va səlləm – dedi: "Kim Allahdan başqa haqq məbudun olmadığını, Tək və şəriksiz olduğunu deyərsə, qəlbi onunla itaət edərsə, dili o sözlə acizliyini hiss edərsə və Muhammədin Onun qulu və elçisi olduğuna şahidlik edərsə, Allah – Azzə və Cəllə - onu atəşə haram edər!" Bunu ət-Tabərani "əl-Əvsat"da rəvayət edir, sənədində Abdurrahmən bin Zeyd bin Əsləm adlı ravi var, alimlərin çoxu onu zəif ravi hesab edirlər.

[37] **Tərcüməçi:** "İstianə" kömək diləməkdir, eləcədə "istiğasə" də bu mənada gəlir. "İstiazə" isə sığınacaq istəməkdir.

[38] əl-Xatib əl-Bəğdadi tarix əsərində (12/64) Ənəs'dən belə dediyini rəvayət edir: "Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Kim ixlasla "lə iləhə illəllah" deyərsə Cənnətə daxil olar!"

Bu, həm də Ənəs bin Malik və Zeyd bin Ərqam'ın hədisindən rəvayət olunur, lakin hər ikisinin də isnadı səhih deyildir. Həsən hökmündə olan mürsəl rəvayətlərdə də eyni məna gəlmişdir.

Bu mənanın təhqiqi və izahı budur ki, qulun "lə iləhə illəllah" söyləməsi onun Allahdan başqa ilahının olmamasını tələb edir. O ilah ki, ona sayğı olunaraq, ucaldılaraq, sevilərək, qorxularaq, ona ümid bağlanılaraq, ona təvəkkül olunaraq, ondan istənilərək, ona dua edilərək itaət olunar və üsyan olunmaz və bütün bunlar yalnız Allah – Azzə və Cəllə - üçün doğrudur. Hər kim ilahiliyin xüsusiyyətləri olan bu əməllərdən hər hansı birində məxluqu şərik qoşarsa bu,"lə iləhə illəllah" sözündəki ixlasını korlaması, tövhidində naqislik olması anlamına gəlir və etdiyi şirkin miqdarı nisbətində məxluqa qulluq etmək deməkdir.

---

Soruşdular: "Ey Allah Elçisi! Bunun ixlası necə olur?" Dedi: "Sizə haram buyurulmuş hər şeydən sizi çəkindirməsi ilə olur."

əl-Heysəmi "əl-Məcmə"də (1/23) deyir: "Zeyd bin Ərqam'dan – radiyallahu anhu - ; dedi: "Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Kim ixlasla "lə iləhə illəllah" deyərsə Cənnətə daxil olar!" Soruşuldu: "Bunun ixlası necə olur?" Dedi: "Allahın haramlarından onu çəkindirməsi ilə olur." ət-Təbərani bunu "əl-Əvsat"da və "əl-Kəbir"də rəvayət edir, amma "əl-Kəbir"də deyir: "Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Bunun ixlası həmin kəsi Allahın haram etdiyindən çəkindirməsi ilə olur." İsnadında Muhammməd bin Abdirrahmən bin Ğazvan adlı ravi var və o, hədis uydurandır.

## Şirkin və küfrün kökü və budaqları vardır

Bunların hamısı şirkin budaqlarıdır[39], buna görə də Allahdan başqasına itaət etməkdən, başqasından qorxmaqdan, başqasına ümid və təvəkkül etməkdən, başqası xətrinə əməl etməkdən doğan çox günaha küfr və şirk adı verilmişdir, necəki riyakarlığa[40], Allahdan başqasına and içməyə[41], başqasına təvəkkül etmək və etimad etməyə şirk adı verilir. Eləcədə məşiyyətdə[42] Allah ilə məxluqu bir bərabərdə tutmağa da şirk adı verilib;

---

[39] əl-Alləmə İbnul-Qayyim əl-Cəvziyyə - rahiməhullah – "Kitəbus-Salət"də (səh: 24) deyir:

"Eynilə küfrün də əsli və şöbələri vardır, beləliklə imanın şöbələri iman sayıldığı kimi küfrün şöbələri də küfr sayılır. Həya imandan bir şöbədir, həyanın az olması isə küfr şöbələrindən bir şöbədir. Doğru sözlülük imanın şöbələrindən bir şöbədir, yalan sifəti isə küfrün şöbələrindən bir şöbədir. Namaz, zəkat, həcc, oruc imanın şöbələrindəndir, onları tərk etmək isə küfrün şöbələrindəndir. Allahın endirdiyi ilə hökm etmək imanın şöbələrindən biridir, Allahın endirdiyindən başqası ilə hökm etmək isə küfrün şöbələrindən biridir. Günahların hamısı küfrün şöbələrindəndir, necəki itaətlərin hamısı imanın şöbələrindən sayılır. İmanın şöbələri iki qismdir; sözlə bağlı olanlar və əməllə bağlı olanlar. Eləcədə küfrün də şöbələri də iki növdür; sözlə bağlı və əməllə bağlı olanlar. İmanın sözlə bağlı olan şöbələrində elə bir şöbə var ki, onun yox olması imanın yox olmasını vacib edir, həmçinin əməllə bağlı olan şöbələrdə elə bir şöbə var ki, onun yox olması imanın yox olmasını vacib edir. Küfrün sözlə və əməllə bağlı olan şöbələri də eynilə bunun kimidir. Öz ixtiyarı ilə bir küfr kəliməsi söyləməklə - və bu, küfrün şöbələrindən bir şöbədir - küfr etdiyi kimi, eləcədə bütə səcdə, Quranla nalayiq davranmaq kimi (küfrün) şöbələrindən olan bir şöbəyə əməl etməklə də küfr etmiş olur və bu, əsli bir qaydadır."

[40] Mahmud bin Ləbid'dən rəvayət olunur ki, Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Sizin üçün ən çox qorxduğum şey kiçik şirkdir." Soruşdular: "Kiçik şirk nədir, ey Allahın Elçisi?" Dedi: "Riyadır! Allah – Azzə və Cəllə - Qiyamət günü insanlara əməllərinə görə mükafatlarını verərkən onlara deyəcək: Dünyada özünüzü riyakarlıqla göstərdiyiniz kəslərin yanına gedin, baxın, görün onlarda (əməllərinizə görə) mükafat tapırsınızmı?" Bunu Əhməd "əl-Müsnəd"də (5/428) rəvayət edir.

əl-Heysəmi "əl-Məcmə"də (10/225) deyir: "ət-Tabərani rəvayət etmişdir, Abdullah bin Şəbib bin Xalid'dən başqa qalan raviləri "əs-Sahih"in raviləridir, o isə siqadır."

[41] Bir nəfər Abdullah bin Ömər'in yanına gəlir və deyir: "Kəbəyə and olsun!" Dedi: "Kəbənin Rəbbinə and iç, çünki Ömər atasına and içərdi və peyğəmbər – salləllahu aleyhi va səlləm – ona dedi: "Atana and içmə, çünki kim Allahdan başqasına and içərsə şirk etmişdir." Bunu Əhməd "əl-Müsnəd"də (2/125), Əbu Davud "əs-Sünən"də, "kitəbul-imən van-nuzur" kitabında (rəq: 3251), ət-Tirmizi "əs-Sünən"də, "kitəbun-nuzur val-imən" kitabında (rəq: 1535) rəvayət etmişdir. əl-Hakim'in rəvayətində isə (1/18) "küfr etmişdir" sözləri keçməkdədir və əl-Hakim deyir: "Bu hədis əl-Buxari və Muslim'in şərtinə görə səhihdir, hər ikisi də bunun kimi isnadı hüccət kimi qəbul ediblər, kitabda hər ikisi də (bunun kimi isnadla) rəvayət ediblər, heç bir illəti yoxdur, lakin bu hədisi rəvayət etməyiblər."

[42] **Tərcüməçi:** Məşiyyət deyildikdə Allahın diləyi, istəyi qəsd olunur. Adətən "bu günah sahibləri Allahın məşiyyəti altındadır" dedikdə bununla qəsd olunan budur ki, bu, Allahın diləyindən asılıdır, Allah dilərsə ona əzab edər, dilərsə bağışlar və Cənnətinə daxil edər. Eləcədə "inşəAllah" dedikdə

"Allah dilərsə və fılankəs diləyərsə"[43] və eləcədə "mənim Allahdan və səndən savayı heç kəsim yoxdur" deməsi bunun misalıdır. Eynilə təvəkkülü[44], fayda və zərərdə Allahı təkləməyi pozan şeylərə uğursuzluq inancı[45], pislənmiş ruqyə[46], kahinlərin yanına getmək və

---

bununla "əgər Allah diləyərsə" mənasını qəsd edirik, çünki biz etiqad edirik ki, hər bir şey Allahın istəyindən, Onun diləyindən asılıdır. Məhz bu səbəblə Allahın məşiyyətində heç kəsi Ona şərik qoşmaq olmaz, yəni "Allah və fılankəs diləyərsə" şəklində söz işlətmək şəriətimiz tərəfindən qadağandır.

[43] Hüzeyfə'dən və onun vasitəsilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyi rəvayət olunur: "Heç zaman "Allah və fılankəs belə dilədi" deməyin! Lakin deyin: "Allah belə dilədi, sonra isə fılankəs belə dilədi." Bunu Əbu Davud "ədəb" kitabında (rəq: 4980) və Əhməd "əl-Müsnəd"də (5/384, 394, 398) əd-Darimi'nin rəvayətində isə (rəq: 2702) deyir: "Heç zaman "Allah və Muhamməd belə dilədi" deməyin! Lakin belə deyin: "Allah belə dilədi və sonra Muhamməd belə dilədi."

[44] **Tərcüməçi:** Kitabı təhqiq etmiş Sabri bin Sələmə qeyd edir ki, kitabın bütün çap olunmuş variantlarında "təvəkkül" deyil, "tövhid" sözü zikr olunur, lakin kitabın təhqiqində əsas götürdüyü əlyazmada isə "təvəkkül" sözü yazılmışdır.

[45] Abu Hureyrə'dən – radiyallahu anhu – və onun vasitəsilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyi rəvayət olunur: "xəstəlikdən yoluxma, uğursuzluq, hamə və safər deyilən şey yoxdur." Bunu əl-Buxari "əs-Sahih"də "tibb" kitabında (7/27) rəvayət etmişdir. Bunu həm də Muslim "əs-Sahih"də "salam" kitabında (2220) rəvayət edir.

**Tərcüməçi:** Zubeyr bin əl-Bəkkar "əl-Muvaffəqiyyət" əsərində qeyd edir ki, cahiliyyə zamanında ərəblər inanırdılar ki, bir kimsə qətl edilərsə və onun qisası alınmazsa, ölünün baş tərəfindən bir "hamə" – və bu, soxulcandır – çıxar və "mənə su verin" deyib durardı. Qisası alındıqda isə çıxıb gedərdi. Dil alimlərindən İbnul-Faris və başqaları da buna yaxın bir şey zikr edirlər, lakin burada artıq "hamə" sözünün soxulcan mənasında olduğunu demirlər. əl-Qazzaz deyir: "Hamə gecə quşlarından bir quşdur", sanki bununla bayquşu qəsd edir. İbnul-Arabi deyir: "Ərəblər həmin quşda bir uğursuzluğun, nəsliyin olduğuna inanardılar, əgər kiminsə evinə qonarsa "mənim ya da ailəmdən kiminsə öləcəyini xəbər verir" deyərdilər. Əbu Ubeyd deyir: Ərəblər iddia edirdilər ki, insan öləndə onun qalıqları "hamə"yə çevrilir və uçur." (Bax: əl-Hafiz İbn Hacər, "Fəthul-Bari", 16/308) Hədisdəki "safər" isə səfər ayında bir uğursuzluğun olduğuna etiqad etməkdir. Bu barədə başqa təfsirlər də gəlmişdir, lakin alimlərin çoxuna görə bunun izahı səfər ayında bir nəsliyin olduğuna inanmaqdır. (Bax: "Lətaiful-Məarif", 1/18)

[46] Abdullah bin Məsud'dan belə dediyi rəvayət olunur: "Allahın Elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Ruqyə, göz muncuqları və məhəbbət tilsimləri şirkdir." Abdullah'ın zövcəsi Zeynəb dedi: "Niyə belə deyirsən? Allaha and olsun ki, gözüm sulanırdı və tez-tez fılan yəhudinin yanına gedirdim ki, mənə ruqyə etsin. Mənə ruqyə etdikdə sakitləşdi." Abdullah dedi: "Bu, şeytan əməlidir. Əli ilə gözünə batırardı, (yəhudi) ruqyə edəndə (şeytan) bunu etməyi durdurdu. Sadəcə Allahın Elçisinin – salləllahu aleyhi va səlləm – dediyi kimi sənə də bu sözləri demək kifayət edərdi: "Əzhibil-Bə'sə, Rabbən-Nəs! İşfi, Əntəş-Şəfi, lə Şifə'ə illə Şifə'ukə Şifə'ən lə Yuğadiru səqamən" (Problemi aradan qaldır, ey insanların Rəbbi! Şəfa ver! Şəfa verən Sənsən. Sənin şəfandan başqa heç bir şəfa yoxdur, elə bir şəfadır ki, özündən sonra heç bir xəstəlik buraxmır." Bunu Əbu Davud (3883) və İbn Macə (3530) rəvayət edirlər.

onların dediklərini təsdiqləməyi[47] aid etmək olar. Eləcədə Allahın qadağan etdiyi şeylərdə nəfsin istəyinə tabe olmaq da tövhidin tamamını və kəmalını korlayır.

Buna görə də şəriət bir müsəlmanı öldürmək[48], heyzli qadınla yaxınlıq etmək, qadına arxadan yaxınlaşmaq,[49] dördüncü dəfə içki içmək[50] kimi nəfsin istəyinə tabe olmaqdan doğan, insanı tamamilə millətdən çıxarmayan çox sayda günaha küfr və şirk adlarını verir.

Buna görə də sələf "kufrun dunə kufr" və "şirkun dunə şirk"[51] kimi sözlər işlədiblər.

Tabe olunan istək və şəhvətlərə də ilah adı verilmişdir; Allahu Təalə deyir: "**Nəfsinin istəyini ilahiləşdirən şəxsi gördünmü?**" (əl-Casiyə, 23) əl-Həsən deyir: "Bu o kəsdir ki, nəfsi nəyi

---

[47] Əbu Hureyrə və əl-Həsən'dən peyğəmbərin – salləllahu aleyhi va səlləm – belə dediyi rəvayət olunur: "Kim kahinin və ya falçının yanına gedər və dediklərini təsdiqləyərsə, Muhammədə ( salləllahu aleyhi va səlləm ) nazil olana küfr etmişdir."

Bunu Əhməd "əl-Müsnəd"də (2/429) rəvayət edir. Həmçinin əl-Hakim "əl-Müstədrək"də (1/8) rəvayət edir və deyir: "Bu hədis əl-Buxari və Muslimin hamısına görə səhihdir, İbn Sirin'in hədisindəndir və əl-Buxari və Muslim bunu (kitablarında) rəvayət etməyiblər." əz-Zəhəbi də onunla razılaşmışdır. Bunu Şeyx Əhməd Şakir – rahiməhullah - ət-Tirmizi'nin "əs-Sünən" əsərində (1/244) yazdığı qeydlərdə səhih sayır, eləcədə Şeyx əl-Albani – rahiməhullah – "Sahihul-Cami"də (5939) səhih saymışdır.

[48] Abdullah'dan rəvayət olunur: Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Müsəlmanı söymək fasiqlik, onunla vuruşmaq isə küfrdür." Bunu əl-Buxari (7/84) və Muslim (rəq: 116) rəvayət edir.

[49] Əbu Hureyrə'dən – radiyallah anhu – rəvayət olunur, o da peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyini rəvayət edir: "Kim heyzli qadınla yaxınlıq edərsə və ya qadınla arxadan yaxınlıq edərsə və ya kahinin yanına gedərsə Muhamməde nazil olana küfr etmişdir." ət-Tirmizi (135) rəvayət etmişdir. Əhməd isə "əl-Müsnəd"də (2/408) "Allahın Muhamməde - aleyhis-salətu vassələm – nazil etdiyindən özünü təmizləmişdir" ləfzi ilə rəvayət etmişdir. Bunu eləcədə Əbu Davud (3904), əd-Darimi (1141) və İbnul-Carud "əl-Muntəqa"da (107) rəvayət ediblər. Şeyx Əhməd Şakir "Sünənut-Tirmizi"də (1/243-244) yazdığı qeydlərində hədisi səhih saymışdır və eləcədə Şeyx əl-Albani də "Sahihul-Cami"də (5942) hədisi səhih sayır.

[50] Müaviyədən rəvayət edirlər: Peyğəmbər – salləllahu aleyhi va səlləm – dedi: "Kim şərab içərsə kötəkləyin, əgər dördüncü dəfə içərsə öldürün!" Bunu ət-Tirmizi (1444), Əbu Davud (4484, 4485) və İbn Macə (2572, 2573) rəvayət edir. ət-Tirmizi hədisi səhih sayır, həmçinin Şeyx əl-Albani "Sahihul-Cami"də (6309) hədisin səhih olduğunu deyir.

ət-Tirmizi öldürmə hökmünün nəsx olunduğunu deyir: "Bundan sonra peyğəmbərin – salləllahu aleyhi va səlləm – yanına dördüncü dəfə şərab içmiş bir nəfər gətirdilər, lakin öldürmədi. Eləcədə əz-Zuhri bunu Qabisa bin Zueyb'dən, o da peyğəmbərdən – salləllahu aleyhi va səlləm – buna yaxın bir şey rəvayət edir. Dedi: "Ölüm hökmünü qaldırdı, daha əvvəl bir rüxsət idi." Bütün alimlərə görə əməl bu hədisə əsaslanır. Bu alimlər arasında qədim və indiki zamanda hər hansı bir ixtilafın olduğunu bilmirik."

[51] **Tərcüməçi**: "Kufrun dunə kufr" sözü bizim dilimizdə "küfrdən kiçik küfr" mənasındadır. Eləcədə "şirkun dunə şirk" sözü də "şirkdən kiçik şirk" deməkdir. Bununla insanı dindən çıxarmayan kiçik küfr və kiçik şirk qəsd olunur və bu söz İbn Abbasdan rəvayət olunmuşdur.

sevərsə onunla əməl edir.”[52] Qatadə[53] dedi: “Bu o kəsdir ki, nəfsi hər nə sevərsə onu yerinə yetirər, hər nəyi istəyərsə, onu edər, heç bir qorxu və təqva onu bundan çəkindirməz.”[54]

Eynilə Əbu Umamə’nin hədisindən mərfu olaraq zəif bir isnad ilə rəvayət olunmuşdur: " Səma altında ibadət olunan ilahlar arasında Allah yanında tabe olunan nəfsdən böyüyü yoxdur."[55]

Başqa hədisdə isə deyir: “dünyalarını dinlərindən üstün tutacaqları bir vaxt gələnə qədər “lə iləhə illəllah” sözü bu sözü deyənləri müdafiə etməyə davam edəcək, bunu etdikləri zaman isə onların özlərinə geri qaytarılacaq və onlara deyiləcək: “Yalan deyirsiz!”[56]

Buna peyğəmbərdən – salləllahu aleyhi va səlləm – səhih olaraq rəvayət olunmuş hədis şahidlik edir: “Dinarın qulu yerlə sürünsün! Dirhəmin qulu yerlə sürünsün! Bahalı və gözəl paltarların qulu yerlə sürünsün! Yerlə sürülsün və üz üstə yuvarlansın! Ayağına tikan batsın da, heç kəs çıxarmasın!”[57]

Bu hədis ona dəlalət edir ki, hər kim bir şeyi sevərsə, ona itaət edərsə, onun ən çox istədiyi və axtardığı şey olarsa, onun üçün dostluq edərsə, onun üçün düşmənlik edərsə onun qulu halına düşər və həmin şey onun məbudu və ilahı olur.

---

[52] əs-Suyuti bu sözləri “əd-Durrul-Mənsur” adlı təfsirində (6/260) İbn Əbi Şeybə, İbnul-Munzir və İbn Əbi Hatim’in əl-Həsən’dən rəvayətinə dayandırmışdır.

[53] **Tərcüməçi:** Əbul-Xattab, Qatadə bin Diamə əs-Sədusi əl-Basri; təfsir, ərəb dili, nəsəb və ərəblərin tarixi üzrə alimdir. Hicri 61-ci ildə doğulmuş və İraqın cəbunubdakı Vasit şəhərində hicri 118-ci ildə vəfat etmişdir.

[54] əs-Suyuti bunu “əd-Durrul-Mənsur”da (6/260) Abd bin Humeyd və İbn Əbi Hatim’in Qatədə’dən rəvayətinə dayandırır.

[55] əs-Suyuti “əd-Durrul-Mənsur”da (6/260) bu hədisi ət-Tabərani’yə aid edir. əl-Heysəmi “əl-Məcmə”də (1/193) deyir: “Bunu ət-Tabərani “əl-Kəbir”də rəvayət edir, sənədində əl-Həsən bin Dinar adlı ravi var və o, hədisləri tərk olunmuş bir ravidir.”

[56] Bunu Əbu Yalə “əl-Müsnəd”də (4034) buna yaxın ləfzlə, əl-Hafiz İbn Hacər “əl-Mətalibul-Aliyyə”də (3274) və əl-Hindi “Kənzul-Umməl”də (221) rəvayət edirlər. əl-Heysəmi “Məcməuz-Zəvaid”də (7/280) deyir: “Bunu əl-Bəzzar rəvayət edir, sənədində Abdullah bin Muhamməd bin Aclən adlı ravi var və o, çox zəifdir.” əl-Heysəmi yaxın bir ləfzə bu hədisin başqa yolla rəvayətini zikr edir və deyir: “əl-Bəzzar rəvayət etmiş, isnadı həsəndir.”

[57] əl-Buxari (3/223), İbn Macə (4136)

## Şeytana itaət ər-Rahmənin tövhidini pozur

Günahda şeytana itaət etməyi Allahu Təalənin şeytana ibadət adlandırması da buna dəlalət edir, Allahu Təalə deyir: "**Məgər mən sizə buyurmadımmı ki, şeytana ibadət etməyin, o sizin açıq-aydın düşməninizdir.**" (Yasin, 60)

Allahu Təalə İbrahimin hadisəsini zikr edərək onun atasına belə dediyini buyurur: "**Atacan! Şeytana ibadət etmə! Həqiqətən, şeytan Mərhəmətli Allaha çox asi oldu.**" (Məryəm, 44) Kim ər-Rahmənə qulluq etməyin, Ona itaət etməyin haqqını vermirsə, şeytana itaət etməklə ona ibadət etmiş olur. Yalnız ər-Rahmənə ixlas ilə qulluq edən kimsə şeytana ibadət etməkdən qurtula bilər və Allah onlar haqqında belə buyurur: "**Şübhəsiz ki, qullarım üzərində sənin heç bir hökümranlığın yoxdur.**" (əl-Hicr, 42) "Lə iləhə illəllah" sözünün haqqını verənlər də məhz onlardır və onu ixlasla deyirlər və dili ilə deyərkən əməlləri ilə təsdiqləyirlər və nə məhəbbətdə, nə ümiddə, nə qorxuda, nə itaətdə, nə də təvəkküldə Allahdan başqasına əhəmiyyət verməzlər. "Lə iləhə illəllah" sözlərini sidq ilə söyləyənlər də onlardır. Allahın həqiqi qulları da onlardır.

Lakin kim "lə iləhə illəllah" sözlərini dili ilə deyərsə, sonra Allaha qarşı günahda, Ona qarşı müxalifətdə şeytana və öz nəfsinin istəyinə itaət edərsə, onun bu əməli dili ilə dediklərini təkzib etmiş olur. Seytana və nəfsinin istəyinə itaət etməklə Allaha qarşı etdiyi üsyanın miqdarı qədər tövhidinin tamamından azaltmışdır. "**Allahdan bir doğru yol göstəricisi gəlməyincə öz nəfsinin istəyinə uyandan daha çox azmış kim ola bilər?!**" (əl-Qasas, 50) "**Nəfsin istəyinə uyma, yoxsa o səni Allahın yolundan azdırar.**" (Sad, 26)

Ey insan! Allahın qulu ol, nəfs istəyinin qulu olma, çünki nəfsin istəyi sahibini atəşə salır: "**Ayrı-ayrı tanrılar yaxşıdır yoxsa Tək olan, hər şeyə Qalib gələn Allah?**" (Yusuf, 39) "Dirhəm qulu həlak olsun! Dinar qulu həlak olsun!" Allaha and olsun ki, Tək olan Allaha qulluğun haqqını verən kəsdən savayı heç kəs sabah Allahın əzabından qurtula bilməyəcək!

Kim ilahının, məbudunun tək bir fərd olduğunu bilirsə ibadətlərində onu təkləşdirsin! "**İbadətlərində Rəbbinə heç kəsi şərik qoşmasın**!" (əl-Kəhf, 110)

Ariflərdən biri dağın başında öz tələbələri ilə danışır və sözlərində bunu deyir: "Fərd bir fərd ilə təkləşmədikcə heç kəs öz muradına çata bilməz." Sonra özünü pis hiss etməyə başladı və ürəkdən getdi. Əshabı qayaların silkələndiyini gördü və saatlar boyunca bu halı üzərində qaldı. Ayıldıqda sanki qəbirdən yeni dirildilmişdi.

İnsanın "lə iləhə illə Allah" söyləməsi Allahdan başqasını sevməməsini tələb edir, çünki ilah o kəsdir ki, məhəbbət, qorxu və ümid ilə itaət olunur. Allahın sevdiyini sevmək, Allahın xoşlamadığını xoşlamamaq isə Allahı sevməyin kamilliyindəndir. Kim Allahın xoşlamadığı bir şeyi sevərsə, Allahın sevdiyi bir şeyi bəyənməzsə nə tövhidi tamamlanar, nə də "lə iləhə illə Allah" deyərkən (tələb olunan) səmimilik tamanlanmış olur. Bununla da həmin insanda Allahın sevdiklərindən bəyənmədiyi miqdarda, bəyənmədiklərindən isə sevdiyi miqdarda gizli şirk olur. Allahu Təalə deyir: "**Bu ona görədir ki, onlar Allahın qəzəbinə səbəb olan**

**şeyə uydular və Onun razı qaldığı şeyə nifrət etdilər. Buna görə də Allah onların əməllərini boşa çıxartdı.**" (Muhamməd, 28)

## Allah sevgisinin dəlilləri

Əl-Leys[58] Allahu Təalənin "**heç nəyi Mənə şərik qoşmurlar**" sözləri haqqında Mücahidin[59] belə dediyini rəvayət edir: "(Mənası budur ki, ) Məndən başqasını sevməyin!"

əl-Hakim "əs-Səhih" əsərində[60] Aişə vasitəsi ilə peyğəmbərdən – sallallahu aleyhi va səlləm – rəvayət edir: "Şirk, zülmət gecədə daş üstündə kiçik qarışqanın addımlarından da gizlidir. Bunun ən gizli dərəcəsi zülmdən bir şeyi sevmək və ya adillikdən bir şeyə nifrət etməkdir, məgər din sevgi və nifrətdən ibarət deyilmi?!" Allahu Təalə deyir: "**De: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın!**"[61] (Ali-İmran, 31) Bu, açıq-aşkar dəlildir ki, Allahın bəyənmədiyini sevmək və Onun sevdiyinə nifrət etmək nəfsin istəyinə tabe olmaqdır və buna görə dostluq etmək, bunun üzərində düşmənçilik etmək gizli şirkin bir növüdür.

əl-Həsən demişdir: "Bil ki, Allaha itaət etməyi sevməyincə Allahı heç zaman sevməyəcəksən!"

Zu'n-Nun'dan[62] soruşdular: "Nə zaman Rəbbimi sevmiş oluram?" Dedi: "Onun nifrət etdiyi bir şey sənə üçün səbr edilə bilinməyəcək qədər acı olduqda!" Bişr bin əs-Sirri[63] demişdir: "Sevgilinin nifrət etdiyi bir şeyi sevmək məhəbbətin əlamətlərindən deyildir!"

---

[58] **Tərcüməçi:** İmam əl-Leys  bin Sad; zamanında hədis və fiqhdə Misirin imamı olmuşdur. Əslən Xorasan bölgəsindəndir. Misirin Qalqaşəndə kəndində doğulmuşdur. Hicri 175-ci ildə Qahirədə vəfat etmişdir.

[59] **Tərcüməçi:** Əbul-Haccəc, Mücahid bin Cəbr; tabiin nəslindəndir, Quran alimlərinin və təfsir alimlərinin şeyxidir. Hicri 21-ci ildə anadan olmuş və hicri 104-cü ildə vəfat etmişdir.

[60] əl-Hakim'in kitabının əsl adı "əl-Mustədrək aləs-Sahiheyn" olacaq. Lakin İbn Racəb'in – rahiməhullah – buna "əs-Səhih" söyləməsi çox yumşaq bir hökmdür, çünki bu kitabda çoxlu zəif və batil hədislər var.

[61] Bunu əl-Hakim "əl-Mustədrək"də (2/291) rəvayət edir və deyir: "Bu, isnadı səhih bir hədisdir və əl-Buxari ilə Muslim bunu (kitablarında) rəvayət etməyiblər." əz-Zəhəbi "ət-Təlxis"də bunu tənqid edərək deyir: "Sənədində Abdul-Alə adlı ravi var, əd-Dəraqutni deyir: siqa deyil." Hədis zəifdir, lakin hədisin birinci tərəfi bir çox yolla rəvayət olunub, bunlar zəif olsa da bu yolların hamısı birlikdə hədisi həsən dərəcəsinə qaldırı. Bax: "Məcməuz-Zəvaid", 1/226-227. Əhməd "əl-Müsnəd"də ( 4/403, 417), Əbu Yalə "əl-Müsnəd"də (rəq: 58, 60, 61) rəvayət edir. əs-Suyuti "əd-Durrul-Mənsur"da (2/179) bunu İbn Əbi Hatim'ə aid etmişdir. Əbu Nueym "əl-Hilyə"də, eləcədə əş-Şəvkani "Fəthul-Qadir"də (1/504) rəvayət etmişdir.

[62] **Tərcüməçi:** Zun-Nun əl-Misri; məşhur zahid olmuşdur. Əsl adı Səubən bin İbrahim'dir. əl-Feyd bin İbrahim olduğu da söylənmişdir. əl-Hafiz əz-Zəhəbi "əl-Mizan"da deyir: "Onun mübahisəli olan bəzi hədisləri var." Əslən Nubə'dəndir və hicri 245-ci ildə vəfat etmişdir.

Əbu Yaqub ən-Nəhracuri[64] demişdir: “Allahı sevdiyini iddia edən, lakin Allahın əmrində ona tabe olmayan hər bir kəsin iddiası batildir.”

Yəhya bin Muaz[65] isə demişdir: “Allahı sevdiyini iddia edən, lakin Onun qanunlarını qorumayan kimsə doğru sözlü deyildir.”

Ruveym[66] isə deyir: “Məhəbbət və razılıq bütün hallarda olmalıdır” və bu şeri oxudu:

ولـــو قلـــت لي مت مت سمعًا وطاعة      وقلت لداعي الموت أهلًا ومرحبًا

**“Əgər “öl!” desən, eşidərək, itaət edərək ölərəm,**

**Ölüm dəvətçisinə isə “xoş gəlmisən” deyərəm!**

Bu mənaya həm də Allahu Təalənin bu sözləri də şahidlik edir: “**De:** “**Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin.**”

əl-Həsən dedi: “Peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələri dedilər: “Ey Allahın Elçisi! Biz Rəbbimizi çox şiddətli sevirik.” Allah da sevgisi üçün bir əlamət qoymağı istədi və beləliklə bu ayə nazil oldu.[67]

Buradan öyrənirik ki, “lə iləhə illə Allah” şahidliyi yalnız və yalnız Muhammədin Allahın Elçisi olmasına şahidlik etməklə tamamlanmış olur və əgər Allah sevgisinin yalnız Onun sevdiyini sevməklə və bəyənmədiyini bəyənməməklə tamamlandığı bilinərsə, o zaman Allahın nəyi sevdiyini və nəyi bəyənmədiyini yalnız - Allahın nəyi sevdiyini və nəyi bəyənmədiyini təbliğ edən - Muhamməd vasitəsilə bilmək olar. Bununla da Allahı sevmək

---

[63] **Tərcüməçi:** Bişr bin əs-Sirri əl-Əfvah; Əbu Amr əl-Basri sonra əl-Məkki; vaaz əhlindəndir, cəhmi olmaqda ittiham olunmuşdur. Lakin alimlər onun üçün üzr gətirmişlər, tövbə etmişdir. Mütəkəllimdir. “əl-Kutubus-Sittə”də hədisləri vardır. Hicri 195-ci ildə 63 yaşında vəfat etmişdir.

[64] **Tərcüməçi:** İshaq bin Muhamməd Əbu Yaqub ən-Nəhracuri; əl-Əhvaz və Meysan arasındakı Cur çayına nisbət edilmişdir. Sufilərin alimlərindəndir. əl-Cuneyd, Amr bin Osman əl-Məkki, Əbu Yaqub əs-Susi və başqalarına yoldaşlıq etmişdir. Məkkənin yaxınlığında uzun illər yaşamışdır. Hicri 330-cu ildə vəfat etmişdir.

[65] **Tərcüməçi:** Məşhur zahiddir; Əbu Zəkəriyya Yəhya bin Muaz bin Car ər-Razi ; Bəlx şəhərinə səfər etmiş, bir müddət orada qaldıqdan sonra Neysəbura qayıtmış və orada hicri 250-ci ildə vəfat etmişdir.

[66] **Tərcüməçi:** Əbu Muhamməd Ruveym bin Əhməd əl-Bağdadi; Bağdad əhlindəndir, zahiri məzhəbinin fəqihlərindən olmuşdur, yəni Davud əl-Əsbəhani’nin əshabından idi. Hicri 303-cü ildə vəfat etmişdir.

[67] Bunu əs-Suyuti “əd-Durrul-Mənsur”da (2/177-178) İbn Cərir və İbnul-Munzir’in əl-Həsən əl-Basri’dən rəvayətlərinə dayandırır. Bunu eləcədə İbn Əbi Hatim və İbn Cərir’in Abbəd bin Mənsur yolu ilə rəvayətlərinə aid etmişdir. Yenə əl-Həkim ət-Tirmizi’nin Yəhya bin Əbi Kəsir’dən və İbn Cərir ilə İbnul-Munzir’in İbn Cureyc’dən rəvayətlərinə dayandırmışdır. Eynilə əş-Şəvkani də “Fəthul-Qadir”də (1/503) bu cür etmişdir.

Onun elçisini də - salləllahu aleyhi va səlləm – sevməyi, onu təsdiq etməyi və onun yolunu izləməyi tələb edir.

Buna görə də Allah Öz sevgisi ilə elçisinin sevgisini yan-yana qeyd edərək demişdir: "**De: "Əgər atalarınız, oğullarınız, qardaşlarınız, zövcələriniz, yaxın qohumlarınız, qazandığınız mallar, iflasa uğramasından qorxduğunuz alış-verişiniz və bəyəndiyiniz məskənlər sizə Allahdan, Onun Elçisindən və Onun yolunda cihaddan daha əzizdirsə, Allah Öz əmri ilə gəlincəyə qədər gözləyin. Allah günahkarları doğru yola yönəltməz.**" (ət-Tövbə, 24) Eynilə Özünə itaət etmək ilə elçisinə - salləllahu aleyhi va səlləm - itaət etməyi bir çox yerdə yan-yana qeyd etmişdir.

Peyğəmbər – salləllahu aleyhi va səlləm – deyir: "Üç şey var ki, bunlar kimdə olarsa imanın şirinliyini hiss etmiş olar: Allah və elçisinin ona başqalarından daha sevimli olması, bir kimsənin sevdiyini yalnız Allah üçün sevməsi, bir kimsənin Allah onu küfrdən qurtardıqdan sonra atəşə atılmaqdan qorxduğu kimi küfrə geri dönməkdən qorxması."[68]

---

[68] əl-Buxari (1/9 və 8/56), Muslim (67, 68)

## İnsanın zahiri ilə batini bir-birilə bağlıdır

Bu, sehirbazların halı idi, məhəbbət onların qəlblərində məskunlaşdıqda , öz canlarını fəda etməyə razı oldular və Firona belə dedilər: "Edəcəyini eylə!" Məhəbbət qəlbdə yaxşıca yerləşdikdə əzalar Rəbbin itaətindən başqa bir şeyə can atmaz.[69]

əl-Buxari'nin "əs-Səhih"də rəvayət etdiyi ilahi hədisin mənası da elə budur və həmin hədisdə deyilir: "Qulum nafilə ibadətlərlə Mənə yaxınlaşmağa davam edər ki, nəhayət onu sevərəm və artıq onu sevdikdə eşidən qulağı, görən gözü, tutan əli, yeriyən ayağı olaram."[70] Rəvayətlərdən birində isə deyir: "Mənimlə eşidər, Mənimlə görər, Mənimlə əl tutar və Mənimlə yeriyər."

---

[69] Zahir ilə batinin bir-birini qarşılıqlı tələb etməsi anlayışı əsli bir qaydaya, şəriətin dayaqlarından birinə çevrilmişdir. əş-Şatibi "əl-Muvaffəqat"da (1/233) deyir: "Buna əsasən zahiri əməllər şəriətdə batində olanın dəlili sayılmışdır. Əgər zahirdə bir qarışıqlıq varsa, batində də eyni şeyin olmasına hökm verilir, əgər doğrudursa, batində də eyni şeyin olmasına hökm verilir. Fiqhdə və digər adi və təcrübi əhkamlarda bu ümumi bir əsl sayılır. Şəriətin tamamında buna iltifat etmək bu baxımdan çox faydalıdır. Bunun sihhəti barədə dəlillər də çoxdur. Bu, mömininin imanına, kafirin küfrünə, müti birinin itaətinə, asi birinin üsyanına, adilin ədalətinə, yaralayanın yaralamasına hökm etmək üçün kifayət edən bir dayaqdır, ölçüdür. Əqdlər buna görə bağlanır, anlaşmalar və sair işlər bununla tərtib olunur. Bundan başqa şeylər də bununla bağlanır. Bu təşrinin tamamıdır və xüsusi və ümumi islami şüarlar olan həddlərin tətbiqinə nisbətdə mükəlləfiyətin əsasıdır." Şeyxul-İslam İbn Teymiyyə - rahiməhullah – "Məcmu əl-Fətəva"da (7/187) deyir: "Qəlbi elm, qəlbi əməl və qəlbdəki iman baxımından insanın qəlbinin doğru olması cəsəddə də zahiri söz və əməldən ibarət mütləq imanın olunmasını zəruri olaraq tələb edir, necəki əhul-hədis imamları deyərdilər: "iman söz və əməldir." Söz həm batini, həm də zahiri olur, eləcədə əməl də həm batini, həm də zahiri olur. Zahir batinə tabedir, batinin qaçınılmaz nəticəsidir. Batin doğru olarsa, zahir də doğru olar, lakin əgər batil pozularsa zahir də pozular. Elə buna görə də səhabələrdən biri qayğısız namaz qılan kəsə "əgər bu qəlbi xuşu içində olarsa, əzaları da xuşu içində olar." Qəlbin imanında Allah və peyğəmbər sevgisinin olması və Allah və peyğəmbərin onun üçün hamıdan sevimli olması qaçınılmazdır." Alləmə İbnul-Qayyim "Kitəbus-Salət"də (səh: 25) deyir: "Əvvəl də izah olunduğu kimi qəlbin itaətinin olmaması kəsin bir təsdiqin olmamasının bir nəticəsidir. Çünki əgər qəlb itaət edər və bağlanarsa əzalar da itaət edər və bağlanar. Onun itaət etməməsi və bağlanmaması, itaəti tələb edən təsdiqin olmaması deməkdir, beləki bu imanın həqiqətidir. Daha da əvvəl qeyd olunduğu kimi iman mücərrəd bir təsdiq deyildir. Ancaq iman itaət və bağlılığı tələb edən təsdiqdir." Alləmə İbn Rəcəb əl-Hənbəli "Cəmi'ul-Ulum val-Hikəm" kitabında (səh: 65-66) deyir: "Əzaların əməlləri yalnız qəlbin doğru olması ilə doğru ola bilər, qəlbin doğru olması isə qəlbin Allahu Təalənin sevgisi, Ona itaət etmək sevgisi və ona üsyan etmək nifrəti ilə dolu olması anlamına gəlir..." və sonra dedi: "Cəsədin hərəkətləri qəlbin hərəkətləri və istəyinə tabedir, əgər qəlbin hərəkətləri və istəyi yalnız Allah üçün olarsa, qəlb doğru olar və cəsədin bütün hərəkətləri də doğru olar. Lakin əgər qəlbin hərəkətləri və istəyi Allahdan başqası üçün olarsa, qəlb korlanar və qəlbin korlanmış olduğu miqdarda cəsədin hərəkətləri də korlanmış olar."

[70] əl-Buxari, 7/190

Bunun mənası budur ki, əgər Allah sevgisi insanın qəlbini bürüyərsə və ona sahib olarsa əzalar Rəbbin razı qaldığı işlərdən başqasına can atmaz, nəfs rahatlıq tapar və Mövlanın iradəsi ilə öz muradı və istəyi yox olar.

Ey insan! Allahdan umduğunun xatirinə deyil, Allahın səndən istəyinə görə ibadət et! Kim Allahdan umduğunun xatirinə ibadət edirsə küfr ilə iman arasında ən son tərəf üzərində Allaha ibadət edənlərdən olar.  Əgər ona bir xeyir çatsa, onunla rahatlıq tapar. Yox, əgər başına bir iş gələrsə, dünyasını və axirətini itirərək üz döndərib küfrə qayıdar. Lakin mərifəti və məhəbbəti gücləndikdə isə nəfsin sahibi yalnız Mövlasının istədiyini əks etdirər.

Əski kitablardan bəzilərində deyilir: Kim Allahı sevərsə heç bir şey onun üçün Allahın razılığından əziz olmaz və kim dünyanı sevərsə heç bir şey onun üçün nəfsinin istəyindən əziz olmaz.

İbn Əbi’d-Dunyə isnadı ilə əl-Həsən’dən belə dediyini rəvayət edir: “Bir işin itaət və ya günah olduğuna nəzər salmadan nə gözümlə baxdım, nə dilimlə danışdım, nə əlimlə tutdum, nə də ayaqlarım üstə durdum. Əgər bir itaət olarsa həmin işə öncəliklə başlardım, əgər günah olarsa o işdən geri qalardım.”

Bu, Allahı sevən xüsusi kəslərin halıdır! Allah sizə rəhm etsin! Bunu anlayın! Beləki bu, tövhidin dərin sirlərinin dəqiqlikləridir. Peyğəmbər də - salləllahu aleyhi va səlləm – Mədinəyə daxil olarkən verdiyi xütbəsində danışaraq məhz buna işarə etmişdir. “Bütün qəlbləriniz ilə Allahı sevin!”[71] Bunu İbn İshaq və başqaları zikr ediblər.

Şübhəsiz ki, kimin qəlbi Allah sevgisi ilə dolarsa artıq orada nəfsin istəklərinə və havasına boş yer qalmaz və şair növbəti sözləri ilə buna işarə etmişdir:

أروح وقد ختمت على فؤادي    بحبك أن يحل به سواكا

فلو أني استطعت غضضت طرفي    فلم أنظر به حتى أراكا !

أحبك لا ببعضي بل بكلي    وإن لم يبق حبك لي حراكا

وفي الأحباب مخصوص بوجد    وآخر يدعي معه اشتراكا

إذا اشتبكت دموع في خدود    تبين من بكى ممن تباكى !

فأما من بكى فيذوب وجداً    وينطق بالهوى من قد تشاكى

**Gedirəm... Könlümə sevginlə möhür vurmusan**

**Səndən başqasına orda yer olmaz,**

---

[71] Bunu İbn Hişam “əs-Siratun-Nəbəviyyə”də (2/146-147) sənədsiz rəvayət edir, eynilə əl-Beyhəqi “Dəlailun-Nubuvvə”də (2/524-525) rəvayət edir.

**Bacarsam gözümü yerə dikərəm, səni görməyincə gözlə baxmaram!**

**Sevgin məndə can buraxmasa da, bir hissəmlə deyil, bütünlüyümlə,**

**Səni sevərəm...**

**Əsl sevgi sevgililərə xas olar, başqası buna şərik olduğunu iddia edər,**

**Lakin göz yaşları yanaqlarda qarışdıqda, əsl ağlayan ilə yalandan ağlayan bir-birindən seçilər**

**Əsl ağlayan güclü sevginin təsiri ilə əriyər,**

**bir-birilərinə şikayət edənlər nəfsin istəyi ilə danışar!**

Sevən kəs, qəlbində öz nəfsi üçün bir pay ayırarsa, əlində tutduğu məhəbbət sadə bir iddiadan başqa bir şey olmaz. Əsl sevən, nəfsinə tamamilə son qoyan və sevgilisi ilə tək başına qalan kimsədir; "Beləliklə Mənimlə eşidər və Mənimlə görər!"

Qəlb Rəbbin evidir. İsrailiyyatdakı rəvayətlərdən birində Allah deyir: "Nə səmaya, nə də Yer üzünə sığa bilmədim, lakin mömin qulumun qəlbinə sığdım."[72] Qəlbdə Allahdan başqası da yer aldığı zaman, Allah şərikə layiq olmayan zənginlərin ən zəngini olduğu[73] üçün nəfs istəklərinin bütləri ilə bir arada olmağa razı olmaz. əl-Haqqu Təalə qısqancdır, mömin qulunun qəlbində Özündən başqasının məskən salmasına və qəlbində razı qalmadığı bir şeyin olmasına görə mömin quluna qısqanar.

**أردناكم صرفاً فلما مزجـتم          بعدتم بـــمقدار التفاتكم عنا**

**وقلنا لكم : لا تسكنوا القلب غيرنا          فأسكنتم الأغيار ما أنتم منا**

**Sizi ən təmiz halda istədik, lakin siz qarışdıqda,**

**Bizdən üz döndərdiyiniz qədər uzaqlaşdınız.**

---

[72] Müəllif – rahiməhullah – doğru olaraq bunun israiliyyatdan gəlmiş bir xəbər olduğunu demişdir. Yoxsa adi insanlar və sufilər arasında bunun peyğəmbərin – salləllahu aleyhi va səlləm – mərfu bir hədisi olması fikri məşhurdur, lakin bu doğru deyildir, həqiqətdə bu sözün heç bir əsli yoxdur. Şeyxul-İslam'dan bu barədə soruşdular və bunun cavabında dedi: "Allaha həmd olsun! İsrailiyyatdan gələn bu xəbərin peyğəmbərdən – salləllahu aleyhi va səlləm – bilinən heç bir isnadı yoxdur. Mənası isə budur ki, "Mənim sevgim və marifətim qulumun qəlbinə sığdı." "Qəlb Rəbbin evidir" şəklində rəvayət olunan söz də bu növdəndir, çünki qəlb Allahu Təaləyə iman və Onun marifətinin və Onun sevgisinin evidir." Bax: "Məcmu əl-Fətava", 18/122; Yenə 376-cı səhifədə buna yaxın bir söz söyləmişdir.

[73] Əbu Hureyrə'dən – radiyallahu anhu – rəvayət olunur ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – demişdir: "Allah Təbərakə va Təalə deyir: "Mən ortaqlar içində şirkə layiq olmayacaq qədər zənginəm, kim bir əməl edər və bu əməlində başqasını Mənə şərik qoşarsa onu öz şirki ilə baş-başa buraxaram." Bunu Muslim "əs-Sahih"də (2985), Əhməd "əl-Müsnəd"də (2/301, 435), İbn Macə "əs-Sünən"də (4202) və Əbu Yalə "əl-Müsnəd"də (6552) rəvayət edirlər.

**Sizə dedik: Qəlbinizdə bizdən başqasına yer verməyin!**

**Başqalarına yer verdiniz, siz bizdən deyilsiniz!**

## Yalnız sağlam qəlb sahibi qurtulacaq

Sabah sağlam, Allahdan başqasına yer verilməmiş bir qəlb ilə Allahı qarşılayandan başqa heç kimsə qurtulmayacaq. Allahu Təalə deyir: "**O gün ki, nə var-dövlət, nə də oğul-uşaq bir fayda verməyəcək, ancaq sağlam bir qəlblə Allahın hüzuruna gələnlərdən başqa!**" (əş-Şüəra, 88-89)

Sağlam qəlb isə günahların çirkindən təmiz olan qəlbdir, lakin Allahın bəyənmədikləri şeylərdən biri ilə özünü bulamış bir qəlb isə Müqəddəs Allahın hüzurunda bir yer tutmağa yaramaz. Yalnız əzab körüyündə təmizləndikdən sonra mümkün olar. Əgər qəlbdəki çirkinliklər yox olarsa, yalnız o zaman Allahın yanında yer tutmağa layiq olar. "Şübhəsiz ki, Allah gözəldir və gözəl şeydən başqasını qəbul etmir."[74]

Gözəl qəlblər isə ilk başdan Allahın yanında məqam sahibi olmağa layiqdirlər. "**Səlamun aleykum! Gözəl idiniz. Əbədi qalmaq üçün buraya daxil olun!**" (əz-Zumər, 73) "**O kəslər ki, pak olduqları halda, mələklər onların canını alıb deyirlər: "Səlamun aleykum! Əməllərinizə görə Cənnətə girin!**" (ən-Nəhl, 32)

Daha əvvəl qeyd etdiklərimizə baxmayaraq bu gün qəlbini kədər və peşmançılıq atəşi ilə və ya Sevgili ilə görüşmək özləmindən doğan atəş ilə yandırmayan kimsələr üçün cəhənnəm atəşi daha qaynar olacaqdır.

Tövhidi həyata keçirməmiş və haqlarını tam ödəməmiş kimsələrdən başqa heç kəsin cəhənnəm atəşi ilə təmizlənməyə ehtiyacı yoxdur.

---

[74] Muslim (1015), Əhməd (2/328) və ət-Tirmizi (2989) rəvayət edir.

## Riyadan çəkin!

İlk olaraq cəhənnəm atəşini alışdıracaq kəslər müvahhid ibadət əhlindən əməllərində riya edənlər olacaq. Onların arasında isə birinci olaraq atəşə daxil olanlar riyakarlıqla alimlik, mücahidlik edən və riyakarlıqla sədəqə verənlər olacaq[75], çünki riyanın azı da şirkdir.

Riyakarlıq edən kimsə Xaliqin böyüklüyündən cahil olduğu üçün öz əməllərində məxluqu nəzərə alır.

Riyakar kimsə hökmdarın adı ilə imzaları saxtalaşdırar və rüşvətləri özü üçün toplayar və elə zənn edirlər ki, o, hökmdarın zadəganlarındandır və o, hökmdarı tamamilə tanıyır.

Riyakar kimsə saxta dirhəmlərin üzərində hökmdarın adını həkk edir ki, o pullar dövriyyəyə keçə bilsin və saxta pula isə yalnız qeyri-mütəxəssislər aldanar.

Riya əhlindən sonra atəşə şəhvət sahibləri, nəfslərinin istəklərinə itaət etmiş, Mövlalarına üsyan etmiş nəfs istəklərinin qulları daxil olacaqlar. Lakin Allahın həqiqi qullarına gəldikdə isə onlara belə deyiləcək: "**Ey rahatlıq tapmış nəfs! Razı qalmış və razılıq qazanmış halda öz Rəbbinə tərəf dön! Mənim qullarımın cərgəsinə keç! Cənnətimə daxil ol!**" (əl-Fəcr, 27-30)

---

[75] Əbu Hureyrə'dən – radiyallahu anhu – belə dediyi rəvayət olunur: "Allahın Elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Qiyamət günü haqlarında hökm veriləcək ilk insanlar bunlar olacaq: şəhid olmuş bir nəfər, onu (hüzura) gətirəcəklər, sonra ona nemətlər barədə məlumat verəcək və o, bunları tanıyacaq. Allah deyəcək: "Bunlarla nə etdin?" Deyəcək: "Şəhid olana qədər sənin uğrunda döyüşdüm."Allah deyəcək: "Yalan dedin! İnsanların sənin haqqında "cəsurdur" deməkləri üçün vuruşdun və həqiqətən deyilmişdir." Sonra əmr olunacaq və atəşə atılması üçün üzü üstə sürüləcək. Sonra elm öyrənmiş, onu öyrətmiş və Quran oxumuş bir nəfəri gətirəcəklər. Allaha ona nemətləri haqqında məlumat verəcək və o, bunları tanıyacaq. Allah deyəcək: "Bunlarla nə etdin?" Deyəcək: "Elm öyrətdim, onu öyrətdim və Quran oxudum." Deyəcək: "Yalan dedin, sən insanların "alimdir" demələri üçün elm öyrəndin, "qaridir" deməkləri üçün Quran oxudun, həqiqətən elə də deyilmişdir." Sonra əmr olunacaq və atəşə atılması üçün üzü üstə sürüləcək. Sonra Allahın imkanlarını genişləndirdiyi, hər cür növ mal verdiyi bir nəfər gətiriləcək, Allah ona nemətləri barədə məlumat verəcək və adam onları tanıyacaq. Allah deyəcək: "Bunlarla nə etdin?" Deyəcək: "Uğrunda sədəqə verilməsini sevdiyin elə bir yol olmadı ki, o yolda sənin üçün sədəqə vermiş olmayım." Allah deyəcək? "Yalan dedin! Lakin sən bunu insanların sənin haqqında "o, səxavətlidir" deməkləri üçün etdin. Həqiqətən də o cür deyiblər." Sonra əmr olunacaq və atəşə atılması üçün üzü üstə sürüləcək." Bu hədisi Muslim (1905), ət-Tirmizi (2382) rəvayət etmişdir. Müəllifin – rahiməhullah – "ilk olaraq cəhənnəm atəşini alışdıracaq kəslər müvahhid ibadət əhlindən əməllərində riya edənlər olacaq" sözləri ona dəlalət edir ki, o kəslər kafir deyil müsəlman olacaqlar, lakin bu əməllərində ixlaslı olmadıqları üçün atəşdə əzab görəcəklər. Bu, əş-Şatibi'nin "əl-Muvaffəqat" kitabında üstünlük verdiyi görüşdür, bu həmçinin başqa alimlərin də görüşüdür.

Cəhənnəm atəşi muvahhidlərin imanının nuru ilə sönər.

Bir hədisdə deyilir: “Atəş möminlərə deyəcək: “Keç! Nurun atəşimi söndürmüşdür.”[76]

“əl-Müsnəd” əsərində isə Cabir vasitəsi ilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyi rəvayət olunur: “Ora daxil olmamış nə bir mömin, nə də bir facir qalmayacaq! Atəş İbrahim üçün olduğu kimi[77] möminlər üçün sərin və zərərsiz olacaq, hətta sərinliyindən atəşin səsi belə eşidiləcək.”[78]

Bu, sevən kəslərin əl-Xalil’in – aleyhissələm – halından miras aldıqları bir mirasdır.

Cəhənnəm atəşi sevənlərin qəlbindəki sevgi atəşindən qorxar.

əl-Cuneyd[79] demişdir: “Atəş dedi: “Ey Rəbbim! Əgər sənə itaət etməsəydim mənə bir şeylə əzab edəcəkdinmi?” Dedi: “Bəli! Sənin üzərinə böyük atəşimi gətirərəm.” Atəş dedi: “Məgər məndən də böyük, məndən də şiddətli atəşmi var?” Dedi: “Mömin dostlarımda məskunlaşmış Mənə olan sevgilərinin atəşi!”[80]

---

[76] əl-Hafiz əl-Heysəmi “Məcməuz-Zəvaid”də (10/363) deyir: “Bunu ət-Tabərani rəvayət edir, sənədində Suleym bin Mənsur bin Ammər adlı ravi var və o, zəifdir. Həmçinin Şeyx əl-Albani “əs-Silsilə əd-Daifə”də (3413) zəif sayır.

[77] **Tərcüməçi:** Burada Allahu Təalənin “Ənbiya” surəsindəki sözlərinə işarə vardır: “**Onlar dedilər: Əgər ondan əvəz çıxmaq istəyirsinizsə, onu yandırın ki, məbudlarınıza kömək edəsiniz.” Biz: - “Ey od! İbrahim üçün sərin və zərərsiz ol!” – dedik.**” (əl-Ənbiya, 68-69)

[78] Bunu Əhməd “əl-Müsnəd”də (3/328-329) rəvayət edir. əl-Heysəmi “əl-Məcmə”də (10/363) deyir: “Deyirəm: Cabirin bu hədisdən başqa “əs-Sahih”də məvquf bir rəvayəti var. Əhməd rəvayət edir və raviləri siqadır.”

**Tərcüməçi:** Şeyx Nasiruddin əl-Albani deyir: “Əbu Sumeyyə’dən rəvayət edir və Əbu Sumeyyə isə əz-Zəhəbi’nin dediyi kimi məchuldur. O özü və əl-Hakim bunu səhih sayıblar, lakin bu, mübahisəlidir, bura bunu müzakirə etməyin yeri deyil.” Bax: “Kəlimətul-İxlas va Təhqiqu-Mənahə”, səh 41 (qeyd: 2)

[79] **Tərcüməçi:** Əbul-Qasim əl-Cuneyd bin Muhamməd bin əl-Cuneyd əl-Bağdadi əl-Xazzəz; Bağdadda doğulmuş, orada böyümüş və orada da vəfat etmişdir. Atası əslən Nəhavənd’dəndir və Nəhavənd İranda Həmədən bölgəsindəki bir şəhərdir. əl-Qavariri adı ilə tanınırdı və bu, şüşə ilə məşğul olanlara verilən addır. İpək parçalar ilə məşğul olmasına görə əl-Xazzəz adı ilə tanınmışdır. Alimlər onu təsəvvuf məzhəbinin şeyxi hesab edirlər,çünki öz məzhəbini Quran və Sünnətin qaydaları ilə təyin etmişdir. O, belə deyərdi: “Biz yolumuz Quran və Sünnət ilə müəyyən olunur. Kim Qurani əzbərləmir, hədis yazmır və fiqh öyrənmirsə heç kəsə nümunə ola bilməz.” Hicri 297-ci ildə vəfat etmişdir. Allah rəhmət etsin!

[80] **Tərcüməçi:** Şeyx Abdur-Rahmən əl-Bərrak bu sözlər barəsində deyir: “Həqiqətdə bu sözlər münkərdir və müəllifin bu sözlərlə şahidlik etməsi ona layiq bir iş deyil. Lakin sizə zikr etdiyim kimi bəzi elm əhlində sufiliyə meyl olur və sufilərin bəzi şeyxlərinin sözlərini istifadə etməkdə yumşaq davranır.”

http://www.taimiah.org/Display.asp?pid=1&t=book45&f=2twhd00016.htm

| | |
|---|---|
| **قفا قليلاً بها علي فلا** | **أقل من نظرة أزودها** |
| **ففي فؤاد المحب نار جوىً** | **أحر نار الجحيم أبردها** |
| **لولا دموع المحبين تطفيء بعض** | **حرارة الوجد لاحترقوا كمداً** |
| **دعوه يطفي بالدموع حرارة** | **على كبد حرى دعوه دعوه !** |
| **سلوا عاذليه يعذروه هنيةً** | **فبالعذل دون الشوق قد قتلوه !** |

**Durun! Məni bir az gözləyin! Yoluma azuqə olsun deyə, bir dəfə baxmaq istərəm.**

**Sevən kəsin könlündə şiddətli atəş vardır, Cəhənnəm atəşindən də sıcaqdır.**

**Əgər bu şiddətli sevgidəki hərarətin bir hissəsini öldürən göz yaşları olmasaydı,**

**Həsrətdə, kədərdə alışıb yanardılar,**

**Buraxın, qoy susuz ciyərindəki hərarəti göz yaşları ilə sönsün! Buraxın, buraxın!**

**Onu qınayanlardan onu bir az üzrlü görmələrini xahiş edin!**

**Elə həsrət ilə deyil, qınamaqla onu öldürdülər!**

Ariflərdən biri deyərdi: "Rəbbimi özlədiyim üçün qəlbimdə sönmək bilməyən atəş şölələri olduğu halda sizin aranızda hələ də sağ qalmağım təəccüblü deyilmi?!"

| | |
|---|---|
| **ولم أر مثل نار الحب ناراً** | **تزيد ببعد موقدها اتقاداً** |
| **Sevgi atəşi kimi atəş görmədim** | **Uzaq düşdükcə atəşi güclənər** |

Ariflərin Mövlalarından başqası ilə işləri yoxdur və Ondan başqasına maraq göstərməzlər.

Bir hədisdə gəlir ki, "Kim Allahdan başqasına maraq göstərərsə, Allahdan deyildir."[81]

Onlardan biri demişdir: "Kim sənə xəbər versə ki, Onun dostu Ondan başqasına maraq göstərir, ona inanma!"

Davud ət-Tai[82] gecələr deyərdi: "Sənə olan marağım bütün maraqlarımı heç etdi, yuxusuzluqla aramda saziş bağladı, Səni görmək həsrətim məndən bütün ləzzətləri öldürdü, məni şəhvətlərdən ayırdı. Ey Kərim! Sənin həbsindəyəm."

---

[81] əl-Hakim "əl-Müstədrək"də (4/320) rəvayət edir. Rəvayətində əlavə olaraq bu sözlərə yer vermişdir: "Kim müsəlmanların halı ilə maraqlanmazsa, onlardan deyildir." əz-Zəhəbi deyir: "(Sənədindəki) İshaq və Muqatil hər ikisi də siqa deyillər, nə də doğru sözlü deyillər." Eynilə əl-Xatib tarix kitabında (9/373) rəvayət edir. əl-Heysəmi "əl-Məcmə"də (10/251) deyir: "Bunu ət-Təbərani rəvayət edir və sənədində Yezid bin Rabia ər-Rahabi var və o, mətrukdur."

**مالي شغل سواه مالي شغل ما يصرف عن هواه قلبي عذل**

**ما أصنع إن جفا وخاب الأمل مني بدل ومنه مالي بدل**

**Mənim ondan başqa məşğuliyyətim yoxdur, heç bir məşğuliyyətim yoxdur,**

**Qəlbimi onun sevgisindən uzaqlaşdıran hər bir şeyi qınaram!**

**Ümidlər boşa çıxsa, cəfaya düçar olsa nə edərəm?**

**Məni əvəz edən tapılar, amma Onun mənim üçün əvəzi yoxdur!**

Qardaşlarım! Əgər bu mənanı anlasanız peyğəmbərin – salləllahu aleyhi va səlləm – "Kim qəlbdən sidq ilə Allahdan başqa haqq məbudun olmadığına şahidlik edərsə Allah onu atəşə haram edər"[83] sözlərinin mənasını başa düşərsiniz.

---

[82] **Tərcüməçi:** Əbu Suleyman David bin Nuseyr ət-Tai əl-Kufi; Abbasi xəlifə əl-Mehdi'nin zamanında yaşamışdır. Əsli Xorasandandır, lakin Kufədə doğulmuşdur. Bağdada səyahət etmişdir. Əbu Hənifə və başqalarından elm alıb. Kufəyə qayıdarkən insanlardan uzaqlaşır və hicri 165-ci ildə ölənə qədər özünü ibadətə həsr etmişdir. Allah rahmət etsin!

[83] əl-Buxari (1/41) və Əhməd (5/229)

## Kim "lə iləhə illəllah" sözündə sadiq olarsa

## Qiyamət gününün bəlalarından qurtular

Bu sözün əhlindən kim atəşə daxil olarsa, sözündəki sidqin azlığı səbəbi ilə daxil olacaq. Həqiqətən bu söz sidq ilə deyilsə insanın qəlbi Allahdan başqa hər bir şeydən təmizlənər. Allahdan başqasının qalıqları qəlbdə qalarsa bunun səbəbi sözü deyərkən sidqin az olması ilə əlaqədardır.

Kim "lə iləhə illəllah" sözündə sadiq olarsa Ondan başqasını sevməz, yalnız Ona ümid bəslər, Allahdan başqa heç kəsdən qorxmaz, Allahdan başqasına təvəkkül etməz və onda öz nəfsinin və nəfs istəklərinin izlərindən heç bir ləkə qalmaz.

Bununla belə elə zənn etməyin ki, qəsd olunan sevən kəsin məsum olmasıdır! Ondan tələb olunan yalnız budur ki, hər dəfə xəta etdikdə eyiblərini düzəltsin.

Zeyd bin Əsləm[84] demişdir: "Həqiqətən Allah qulunu elə sevir ki, hətta ona olan məhəbbəti o dərəcəyə çata bilir ki, sonunda Allah ona deyir: "Get! İstədiyini et! Artıq səni bağışlamışam!"

əş-Şabi[85] demişdir: "Əgər Allah bir qulunu sevərsə, ona heç bir günahı zərər verməz!"[86]

---

[84] **Tərcüməçi:** Böyük alimlərdən biri, imam, fəqih, abid Əbu Abdirrahmən Zeyd bin Əsləm əl-Ədəvi, atasından və İbn Ömər, Cabir və Aişədən rəvayət edir. Ubeydullah bin Ömər'dən onun haqqında soruşdular, dedi: "Onda heç bir eyib görməmişəm, sadəcə olaraq Quranı öz rəyi ilə təfsir edir" Hicri 136-cı ildə vəfat etmişdir. Allah ona rahmət etsin!

[85] **Tərcüməçi:** Əbu Amr Amir bin Şərahil əl-Humeyri əş-Şabi əl-Kufi, böyük imam, tabiin nəslindən böyük bir alimdir. Ömərin xilafəsindən bir neçə il keçdikdən sonra Kufədə doğulmuşdur. Orada böyümüş və orada vəfat etmişdir. Hədis ravilərindən çox siqa bir ravidir, fəqih və şair biri idi. Alimlər onun hafizəsini misal çəkirlər. əş-Şabi demişdir: "Ağ üzərində qara ilə əsla bir şey yazmadım və kim mənə bir hədis rəvayət edibsə hamısını əzbərləmişəm." Hicri 103-cü ildə vəfat etmişdir. Allah rahmət etsin!

[86] Bu doğrudur, çünki əgər Allah – Azzə və Cəllə - qulunu sevərsə onu çoxlu itaətə müvəffəq edər, xeyir işlər görməkdə ona kömək edər, əgər bir günaha düşərsə ona səmimi bir tövbə etməyi asanlaşdırar, Allah qarşısında acizliyini hiss edər, boyun əyər və tabe olar. Beləliklə günahdan əvvəlki halından da yaxşı bir hala düşər. Alləmə İbnul-Qayyim "əl-Vabil əs-Sayyib min əl-Kələm ət-Tayyib" adlı kitabında (səh: 20) deyir: "Əgər Allah qulu üçün xeyir diləyərsə onun üçün tövbə, peşmançılıq, boyun əymə, acizliyi hiss etmə, ehtiyac içində olduğunu anlama, Allahdan kömək istəmə, Ona səmimi olaraq sığınma, Ona davamlı yalvarma, dua etmə, Allahın onun üçün yaratdığı yaxşı əməllər etməklə Ona yaxınlaşma kimi xeyir qapılarını açar, beləliklə onun o pis əməli Allahın rəhmətinə səbəb olar və buna görə də Allahın düşməni (şeytan) deyər: "Kaş ki, onu tərk edərdim və buna səbəb olmazdım." Bu, sələfdən birinin dediyi "Bəzən qul günah edər və Cənnətə daxil olar, bəzən də yaxşı əməl edər və Cəhənnəmə daxil olar" sözlərinin mənasıdır. Ondan soruşdular: "Axı bu, necə mümkündür?" Dedi:

Bu sözlərin təfsiri budur ki, Allah qulları arasından sevdiyi kəslərə qayğı göstərir və həmin qul hər dəfə sürüşüb nəfs istəyinin uçurumuna düşərsə, Allah onun əlindən tutub qurtuluş yüksəkliyinə qaldırır, onun üçün tövbə yollarını asanlaşdırır, onu xətaların çirkinliyi barəsində xəbərdar edir və qul həmən Rəbbindən üzr diləyir və qul cinayət etdikdə bu cinayətləri üçün kəffarə olacaq müsibətlərlə onu sınağa çəkər.

Əsərlərdən birində[87] gəlir ki, Allah deyir: "Məni zikr edənlər, mənim üçün bir araya toplaşanlar, mənə itaət edənlər, mənim kəramət verdiyim kəslər və mənə üsyan edənlərin rəhmətimə olan ümidlərini boşa çıxarmaram, əgər tövbə edərlərsə Mən onların Həbibi (sevgilisi) olaram, əgər tövbə etməsələr onların Təbibi olaram. Onları eyblərindən təmizləmək üçün müsibətlərlə sınağa çəkərəm."

"Səhih Muslim"də Cabir vasitəsilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət olunur: "Körük (dəmirin) çirkini apardığı kimi qızdırma da xətaları təmizləyir."[88]

"əl-Müsnəd" kitabında və İbn Hibban'ın "əs-Səhih" əsərində Abdullah bin Muğaffəl'dən rəvayət olunur ki, bir kişi cahillikdə fahişəlik etmiş bir qadınla qarşılaşdı, qadına sataşmağa başladı, sonunda əlini ona atanda qadın dedi: "Dur! Allah şirki təmizlədi və İslamı gətirdi". Sonra kişi onu tərk etdi və dönüb getdi. Arxasına dönərək qadına baxaraq getdiyi halda üzü ilə divara dəydi. Üzündən qan axdığı halda peyğəmbərin – salləllahu aleyhi va səlləm – yanına gəldi, ona olanlar haqqında xəbər verdi. Peyğəmbər – salləllahu aleyhi va səlləm – buyurdu: "Sən elə bir qulsan ki, Allah sənə xeyir diləmişdir." Sonra dedi: "Əgər Allah bir quluna xeyir diləyərsə onun cəzasını tezləşdirərək bu dünyada cəzalandırar, lakin əgər quluna şərr diləyərsə əvəzini Qiyamət günü verənə qədər günahlarını o halı üzərində buraxar."[89]

---

"Günah işləyir və qorxaraq, yazıq halda, ağlayaraq, peşmanlıq və Uca Rəbbindən utanaraq, başını aşağı əyər və qəlbi qırılmış halda gözlərini dikib durar, beləliklə həmin günah qulun xoşbəxtliyi və qurtuluşu üçün elə bir səbəb olar ki, hətta sonunda bu günah onun üçün bir çox itaət əməlindən faydalı olar."

[87] **Tərcüməçi:** Kitabı təhqiq edən Sabri bin Sələmə Şahin bu barədə deyir: "Bu rəvayəti tapa bilmədim." Kitabın Şeyx əl-Albani'nin təxrici ilə "Kəlimətul-İxlas və Təhqiqu Mə'nahə" adı ilə çapında (səh: 46) Şeyx əl-Albani deyir: "Yəni səhabədən rəvayət olunmuş əsərlərdə, sanki bu, israiliyyatdan bir xəbərdir."

[88] Muslim (8/16; rəq: 4575)

[89] Əhməd "əl-Müsnəd"də (4/87), İbn Hibban "əs-Sahih"də (2455) və əl-Hakim "əl-Müstədrək"də (1/349, 4/376-377) rəvayət edir. əl-Hakim deyir: "Bu hədis Muslim'in şərtlərinə görə səhihdir, lakin əl-Buxari və Muslim bunu rəvayət etməyiblər." Bunu eləcədə Əbu Yalə "əl-Müsnəd"də (4252) hadisənin özünü zikr etmədən rəvayət etmişdir.

**Tərcüməçi:** Şeyx əl-Albani deyir: "Raviləri siqadır, lakin burada əl-Həsən əl-Basri'nin "an'anə" ilə rəvayət etməsi vardır."

Ey insanlar! Qəlbləriniz təmizlik əsli üzərindədir, sadəcə olaraq günahlarınızın pisliyindən qəlblərinizə sıçramışdır. Siz də qəlblərinizə göz yaşlarınızdan bir az səpin! O zaman təmizlənəcək!

Öz nəfslərinizin şəhvət südü əmmələrini durdurmağa qərar verin! Pəhriz dəvaların başıdır!

Sizdən öz yemini tələb etdikdə, o qadının üzünü qan almış həmin kişiyə dediyi kimi siz də öz nəfslərinizə deyin: Allah şirki təmizlədi və İslamı gətirdi, İslam isə təslimiyyət və itaətə bağlılıq tələb edir.

Allahın "**Şübhəsiz ki, – "Rəbbimiz Allahdır!" - deyən, sonra düz yol tutan kəslərə...**" sözlərində etdiyi tərifi öz nəfslərinizə xatırladın! Ola bilsin ki, nəfsiniz düz yol tutmağa can atar!

Nəfslərinizə kimin şah damarına ən yaxın olduğunu öyrədin ki, bəlkə Onun yaxınlığından və Onun nəzarətindən həya etdi: "**Məgər o, bilmir ki, Allah görür?**" (əl-Aləq, 14) "**Şübhəsiz ki, Rəbbin baxıb görür.**" (əl-Fəcr, 14)

Bir kişi çöllükdə bir gecə bir qadınla yaxınlıq etmək istədi və qadın istəyini geri çevirdi. Kişi qadına dedi: "Bizi parlayan ulduzlardan başqa heç bir şey görmür!" Qadın dedi: "Səncə o ulduzları yaradan hardadır?"

Bir kişi bir qadını öz istəyinə qarşı məcbur etmək istəyir və ona qapıları bağlamağı əmr edir, qadın da bunu edir. Sonra soruşur: "Bağlamadığın bir qapı qaldımı?" Qadın dedi: "Bəli! Bizimlə Allah arasındakı qapı!" Bunun üzərinə kişi qadına toxunmur.

Ariflərdən biri bir kişinin bir qadınla danışdığını görərək deyir: "Həqiqətən Allah sizin ikinizi də görür, qoy Allah bizi və sizi örtsün!"

əl-Cuneyd'dən soruşurlar: "Baxışları qorumaqda kömək kimi nədən istifadə etmək olar?" Dedi: "Allahın sənə baxışının sənin baxdığına baxışından daha tez olduğunu bilmən ilə."

əl-Muhasibi[90] deyir: "(İnsanın öz nəfsinə) nəzarəti, qəlbin Rəbbin yaxınlığını bilməsidir."

İnsan Allahı nə qədər çox tanıyarsa, o qədər də həyası artar, çünki Onun yaxın olduğunu, Onun gördüyünü bilir.

Peyğəmbər – salləllahu aleyhi va səlləm – bir nəfərə, əşirətindən olan, yanından heç ayrılmayan saleh bir nəfərdən həya etdiyi kimi Allahdan da həya etməsini tövsiyə etdi.[91]

---

[90] **Tərcüməçi:** Əbu Abdilləh əl-Haris bin Əsəd əl-Muhasibi əl-Bağdadi; məşhur zahid olmuşdur, bir çox əsəri var, mötəzilə və rafizi əqidəsinə qarşı rəddiyələr yazıb. Onun təsəvvuf mövzusunda o qədər gözəl sözləri var ki, bunlar onun elminin zənginliyini göstərir. əl-Cuneyd'dən rəvayət etmişdir. Hicri 243-cü ildə vəfat etmişdir. Allah rahmət etsin!

[91] Əhməd "əz-Zuhd" kitabında (səh: 59) rəvayət edir. əl-Heysəmi "əl-Məcmə"də (10/287) deyir: "ət-Təbərani bunu rəvayət edir, sənədindəki ravilərin bəziləri zəif olsa da onları siqa sayan da olub."

Ariflərdən biri demişdir: “Allahdan sənə yaxınlığı miqdarında həya et! Allahdan sənin üzərindəki qüdrəti miqdarında qorx!”[92]

Onlardan biri də belə deyərdi: Qırx ildir ki, Allahdan başqası üçün bir addım belə atmamışam və Allahdan – Azzə və Cəllə - həya etdiyim üçün gözəl saydığım bir şeyə belə baxmamışam:

كأن رقيباً منك يرعى خواطري وآخر يرعى ناظري ولساني

فما أبصرت عيناي بعدك منظراً لغيرك إلا قلت قد رمقاني

ولا بدرت من في بعدك لفظة لغيرك إلا قلت : قد سمعاني

ولا خطرت من ذكر غيرك خطرة على القلب إلا عرجا بعناني

**Sanki Sənin bir nəzarətçin düşüncələrimə baxır,**

**Bir başqası isə gözlərimə və dilimə nəzarət edir.**

**Səndən sonra Səndən başqa elə bir mənzərə olmadı ki,**

**“Hər ikisi də məni görəcək” demədən ona baxım!**

**Səndən sonra Səndən başqası üçün elə bir söz olmadı ki,**

**“Hər ikisi də məni eşidəcək” demədən onu ağzımdan çıxarım!**

**O ikisi ağlımdan keçəni bilmədən bir dəfə də olsun**

**Səndən başqasının zikri qəlbimdən keçmədi!**

---

**Tərcüməçi:** Şeyx əl-Albani deyir: “Bunu İbn Adiy (2/53 və 1/203) və əs-Suləmi “Ədəbus-Suhbə”də (səh: 12) Said bin Zeyd vasitəsilə Əbu Umamə’dən iki zəif sənədlə rəvayət edir. Bu hədisi “əs-Silsilə əd-Daifə”də (1500, 1642) təxric etdim.”

[92] **Tərcüməçi:** Mövzu barədə daha əvvəl bəzi zəif rəvayətlər keçdi, ola bilsin ki, oxucu özlüyündə sual verib bu zəif rəvayətlərin nə üçün kitabda yer aldığına təəccüblənsin. Bu münasibətlə Şeyx Abdur-Rahmən əl-Bərrak’ın kitabda keçmiş zəif rəvayətlər haqqındakı sözlərini təqdim edirəm. Şeyx deyir: “Müəllif bu mənaya şahidlik edən bəzi yerlərdə bəzi abidlərin sözlərini, əsərləri və hədisləri zikr etmişdir. Hətta onlardan bəziləri zəif olsa da, elm əhli bu hədislərlə şahidlik etməkdə heç bir problem görmürlər. Hədis zəif olsa da məsələnin təsdiqi və təkidi sabitdir. Bunun bənzəri “ət-tərğib vat-tərhib” hədislərində olur, çünki səhih dəlillərlə sabit olmuş hökmlər və əqidələrdə istifadə olunmuşdur.”

## Tövhid kəliməsinin fəzilətləri

Tövhid kəliməsinin o qədər böyük fəzilətləri vardır ki, onları burada sayıb qurtarmaq mümkün deyildir. Lakin bu barədə gəlmiş xəbərlərdən bəzilərini qeyd edəcəyik.

Ömər və başqa səhabələrin dedikləri kimi bu, təqva kəliməsidir.

O, ixlas kəliməsidir, haqqa şahidlikdir, haqq çağırışdır, şirkdən uzaqlaşmaqdır, bu işin qurtuluşudur,[93] yaradılanlar da onun üçün yaradılmışdır, necəki Allahu Təalə deyir: "**Mən cinləri və insanları yalnız Mənə ibadət etsinlər deyə yaratdım.**" (əz-Zariyat, 56)

Onun xatiri üçün elçilər göndərilmiş, kitablar endirilmişdir.[94] Allahu Təalə deyir: "**Səndən əvvəl elə bir peyğəmbər göndərmədik ki, ona: "Məndən başqa heç bir tanrı yoxdur. Buna**

---

[93] İmam Allәmə İbnul-Qayyim "Tariqul-Hicrateyn"də (səh: 296-297) "Nəfsinə nəsihət edən, nəfsinin xoşbəxtliyini və qurtuluşunu arzu edən biri üçün bu məsələdə elm, əməl və hal baxımından ayıq olması xüsusən diqqətə layiqdir. Qoy bu məsələ onun üçün ən əhəmiyyətli məsələ, ən dəyərli elm və əməl olsun, çünki hər bir şey öz dəyərini bu məsələdə tapır və bu məsələnin ətrafında dövr edir və Qiyamət günü əsas bu məsələ haqqında soruşulacaq. Allahu Taələ deyir: "Rəbbinə and olsun ki, biz onların hamısından törətdikləri əməllər barəsində soruşacağıq." (əl-Hicr, 92-93) Sələfdən birdən çox kimsə bu ayə haqqında deyir: "Yəni "lə iləhə illəllah" sözü barəsində soruşacaq." Bu bir haqdır, çünki bütün suallar onun barəsində, onun əhkamları, haqları, vacibləri və tələbləri barəsində olacaq. Hamı yalnız onun haqqında soruşulacaq, onun vacibləri, haqları və tələbləri haqqında soruşulacaq. Əbul-Aliyyə dedi: "İnsanların birinciləri və sonuncuları da iki kəlimə haqqında soruşulacaqlar: Nəyə ibadət edirdiniz? Peyğəmbərlərə nə cavab verdiniz? Nəyə ibadət edirdiniz sualı Allahın Özü haqqında sorğu etməsidir, peyğəmbərlərə nə cavab verdiniz sualı isə həmin bu ibadətə götürən vasitə və yol haqqında sorğu-sualdır. Onlar bu yolla getdilərmi? Peyğəmbərlərin həmin yola dəvət etdikləri o çağırışa tabe oldularmı? Bütün suallar həmin bu yola tərəf yönəlir. Bu elə bir məsələdir ki, bütün gücləri onun üzərində toplamaq, azı dişləri ilə ondan tutunmaq, yanar kömür olsa belə barmaqların ucu ilə götürməmək, əlin içinə almaq lazımdır...Əlavə bir ehtiyac olaraq deyil, ehtiyacların ən əsası olaraq onu əldə etmək lazımdır, bundan başqa işlər əlavə ehtiyac olmalıdır....Tövfiq Allahdandır, Ondan başqa haqq ilah yoxdur, Ondan başqa rəbb yoxdur."

[94] Allәmə Siddiq Həsən Xan "əd-Dinul-Xalis" adlı kitabında (1/187) deyir: " – "Allahdan başqa haqq məbud yoxdur" – sözləri ən möhkəm dəstəkdir (bax: "əl-Bəqərə, 256), Allahın uca kəlamıdır, rəhimli, asan, təmiz həniflik dinidir və tövhid əhlinin ağası, təqva əhlinin imamı, aləmlərin Rəbbinin dostu, atamız İbrahimin - əleyhissələm – millətidir, onun öz nəsli arasında Qiyamət gününə qədər daimi qalması üçün etdiyi bir kəlimədir. (bax: əz-Zuxruf, 28) Məhz bu sözün xatirinə, bu sözə sahib çıxmaları üçün Allah məxluqatı yaratmışdır. Yeddi yer və yeddi göy bu kəlimə üzərində durur və bütün mövcud şeylər onunla danışır və onun xatirinə kitablar endirilmiş, peyğəmbərlər göndərilmişdir. Allahu Taələ deyir: "Mən cinləri və insanları yalnız Mənə ibadət etsinlər deyə yaratdım." "Elə bir şey yoxdur ki, həmd ilə Ona tərif deməsin." (İsra, 44) Allahu Təalə deyir: "Biz hər ümmətə: "Allaha ibadət edin, tağutdan uzaq durun!" deyə, elçi göndərdik." (ən-Nəhl, 36) Bununla, bu ilahi kəliməyə, müqəddəs cümlənin mənasına xəstə şirkdən təmiz qəlblə etiqad etmək qəsd olunur. Qəsdindən cahil olaraq, tələblərinə əməl etmədən sadəcə dildə bu sözləri tələffüz etməyə gəldikdə isə, bu, qəlbdə ixlaslı bir

**görə də yalnız Mənə ibadət edin!" – deyə vəhy etməyək.**" (əl-Ənbiya, 25) Allahu Təalə deyir: "**Allah Öz hökmü ilə qullarından istədiyi kimsəyə mələkləri vəhylə göndərib buyurur: "Qullarımı qorxudub xəbərdar edin ki, Məndən başqa ibadətə layiq olan məbud yoxdur. Məndən qorxun!** " (ən-Nəhl, 2)

Bu ayə, Allahın "ən-Nəhl" surəsi adlanan nemətlər haqqındaki surəsində qulları üçün nemətləri içindən saydığı ilk nemətdir. Buna görə də İbn Uyeynə[95] demişdir: "Allah qullarına "lə iləhə illəllah" kəliməsini öyrətməkdən daha böyük bir nemət bəxş etməmişdir, beləki cənnət əhli üçün "lə iləhə illəllah" dünya əhli üçün sərin bir su kimidir və Axirətdəki savab yuvası ilə əzab yuvası da məhz bunun xatirinə hazırlanmışdır.

Kim bu kəliməni söyləyib o halı üzərində ölərsə savab yuvasının əhlindən olacaq, kim onu inkar edərsə əzab yuvasının əhlindən olacaqdır.

Onun xatirinə peyğəmbərlərinə cihad etmək əmr olundu, kim bu sözü deyərsə malını və qanını qorumuşdur, kim bu sözdən boyun qaçırarsa malı da, qanı da halal olmuşdur.

O həm də **peyğəmbərlərin dəvətlərinin açarıdır** və bu sözlərlə Allah Musa ilə qarşı-qarşıya danışmışdır.

əl-Bəzzar "əl-Müsnəd" əsərində və başqaları İyad əl-Ənsari vasitəsilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyini rəvayət edirlər: "Şübhəsiz ki, "lə iləhə illəllah" Allah üzərində kəraməti olan haqq bir sözdür, bu sözün Allah yanında məkanı vardır. Bu, bəzən xeyrlərin hamısını toplayan, bəzən də bir hissəsini toplayan bir kəlimədir, kim sadiq olaraq bunu deyərsə Allah onu cənnətə daxil edər, kim yalançı olaraq deyərsə, malını və qanını qorumuş olar, Allahla qarşılaşar, Allah da onu hesaba çəkər."[96] Daha əvvəl də qeyd etdiyimiz kimi bu, Cənnətin açarıdır.

O həm də **Cənnətin qiymətidir**.[97] Bunu əl-Həsən demişdir. Mərfu olaraq isə zəif rəvayət yolları ilə gəlmişdir ki, "Kimin axırıncı kəliməsi o, olarsa Cənnətə daxil olar."[98]

---

tövhid sayılmaz. Bu, ona heç bir fayda verməyəcək və onu Allahın əzabından qurtarmayacaq və zərəri ondan sovuşdurmayacaq."

[95] **Tərcüməçi:** İmam Sufyan bin Uyeynə əl-Hiləli; siqa alimlərdən biri, ümmət onun bir hüccət olmasında icma etmişdir. Hafizəsi güclü biri idi. Vəhb bin Munəbbih deyir: "Allahın Kitabı barəsində İbn Uyeynə'dən elmli birini görmədim." əş-Şafi isə deyir: "Əgər Malik və İbn Uyeynə olmasaydı, Hicazın elmi əldən gedərdi." Hicri 198-ci ildə vəfat etmişdir. Allah rahmət etsin!

[96] əl-Heysəmi "əl-Məcmə"də (1/31) deyir: "əl-Bəzzər rəvayət edir və raviləri siqadır, əgər sənədindəki tabii Abdurrahmən bin Abdilləh bin Məsud'dursa."

[97] Şeyx Usamə Abdulazim "Kəlimətul-İxlas" risaləsinə yazdığı haşiyədə (səh: 45) deyir: "Yalnız bu sözün haqqına vəfalı olduqda, onun haqlarına tabe olduqda, hədlərinə bağlı olduqda, vaciblərini yerinə yetirdikdə Cənnətin qiyməti ola bilər, sadəcə dildə söyləməklə olmaz."

[98] Əhməd "əl-Müsnəd"də (5/233, 247) "kimin sonuncu sözü "lə iləhə illəllah" olarsa Cənnət ona vacib olar" söz ilə rəvayət etmişdir. Əbu Davud isə (3116) "Cənnətə daxil olar" sözü ilə və əl-Hakim "əl-

O, **atəşdən qurtuluşdur**.

Peyğəmbər – salləllahu aleyhi va səlləm – bir müəzzini “əşhədu əllə iləhə illəllah” deyərkən eşitdi və dedi: “Atəşdən çıxdı.” Bunu Muslim rəvayət etmişdir.[99]

Bu söz **insanın bağışlanmasını vacib qılır**.

“əl-Müsnəd” kitabında Şəddad bin Əus və Ubadə bin Samit’dən peyğəmbərin – salləllahu aleyhi va səlləm – bir gün səhabələrinə belə dediyi rəvayət olunur: “Əllərinizi qaldırın və “lə iləhə illəllah” deyin!” O saat əllərimizi qaldırdıq, sonra Allahın Elçisi – salləllahu aleyhi va səlləm - əlini qoydu və sonra dedi: “Bütün həmdlər Allaha aiddir! Ey Allahım! Məni bu kəlimə ilə göndərdin və mənə bu kəliməni əmr etdin və bu kəliməyə görə mənə cənnəti vəd etdin və şübhəsiz ki, Sən vədindən dönməzsən!” Sonra dedi: “Müjdə! Çünki Allah sizi bağışladı!”[100]

O, **həsənətlərin ən yaxşıdır**.

---

Müstədrək”də (1/351, 500) rəvayət edir. əl-Hakim deyir: “Bu hədisin isnadı səhihdir, əl-Buxari və Muslim bunu rəvayət etməyiblər.” əz-Zəhəbi onunla razılaşdı.

[99] Ənəs bin Malik’dən belə dediyi rəvayət olunur: Peyğəmbər – salləllahu aleyhi va səlləm – fəcr vaxtı girəndə basqın edərdi və azanın gəlib gəlmədiyini dinləyərdi. Əgər azan eşitsəydi basqının durdurardı, eşitməzsə basqın edərdi. Bir dəfə bir nəfərin “Allahu Əkbər! Allahu Əkbər!” dediyini eşitdi və peyğəmbər – salləllahu aleyhi va səlləm – dedi: “Fitrət üzərindədir.” Sonra adam dedi: “Əşhədu əllə iləhə illəllah! Əşhədu əllə iləhə illəllah!” Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: “Atəşdən çıxdın!” Baxıb gördülər ki, keçi otaran çobandır.” Bunu Muslim (382) rəvayət edir.

Şeyx Saleh bin Abdilaziz bin Muhamməd Aluş-Şeyx “Həzihi Məfəhimunə” kitabında (səh: 113) deyir: “Peyğəmbərin – salləllahu aleyhi va səlləm – “Allahu Əkbər!” deyən kəsə “fitrət üzərindədir” deməsi, bir faydaya işarə edir. Bu söz və dəlalət etdiyi rububiyyət tövhidi onun fitrət üzərində olduğunu ortaya çıxarır, buna görə də onun atəşdən qurtuluşuna və müsəlman olmasına hökm etmədi. Yalnız Allahdan başqa bütün məbudları inkar etməyi əhatə edən “əşhədu əllə iləhə illəllah” kəliməsindən sonra (müsəlman olduğuna hökm etdi.) Bu, uluhiyyət tövhididir və bunun (insanın müsəlman olmasına) dəlaləti aşkardır.”

[100] Yalə bin Şəddəd’dən belə dediyi rəvayət olunur: Atam Şəddən bin Əus mənə rəvayət etdi və Ubadə bin əs-Samit onun hüzurunda sözünü təsdiqləyirdi; dedi: “Biz peyğəmbərin – salləllahu aleyhi va səlləm – yanında idik və dedi: “Aranızda qərib yoxdur ki?” Kitab əhlini qəsd edirdi. Dedik: “Xeyr, Allahın Elçisi!” Sonra qapıları bağlamağı əmr etdi və dedi: “Əllərinizi qaldırın!” və hədisi zikr etdi. Bunu Əhməd “əl-Müsnəd”də (4/124) rəvayət edib. Həmçinin əl-Hakim “əl-Müstədrək”də (1/501) rəvayət edir və deyir: “İsmayıl bin Ayyəş’in halı bundan bir az əvvəlki hədisdə qeyd olundu. O, Şam əhlinin imamlarından biridir. Onun hafizəsinin zəif olduğu deyilsə də, mənim şərtimə görə belə ravilər qəbuldur.”əz-Zəhəbi isə “ət-Təlxis”də deyir: “Raşid’i əd-Dəraqutni və başqaları zəif sayıb, Duheym isə siqa saymışdır.” əl-Heysəmi “əl-Məcmə”də (1/24) deyir: “Bunu Əhməd, ət-Tabərani və əl-Bəzzar rəvayət edir. Raviləri siqa sayılıblar.” Yenə (10/84) deyir: “Bunu Əhməd rəvayət edir, sənədində Raşid bin Davud adlı ravi var, onun bir çox alim siqa saymışdır, lakin onda zəiflik var. Qalan raviləri siqadır.” Şeyx əl-Albani “Kəlimətul-İxlas” kitabında haşiyədə (səh: 55) deyir: “Sənədində zəiflik var, əl-Mənzuru isə həsən saymışdır.”

Əbu Zər deyir: "Dedim: "Ey Allahın Elçisi! Məni cənnətə yaxınlaşdıracaq və cəhənnəmdən uzaqlaşdıracaq bir əməli mənə öyrət!" Dedi: "Əgər bir pislik etsən yerinə bir yaxşılıq (həsənət) et, beləki bir yaxşılıq on misli qədərdir." Dedim: "Ey Allahın Elçisi! "Lə iləhə illəllah" bu həsənətlərdəndirmi?" Dedi: "O, həsənətlərin ən yaxşıdır."[101]

Bu söz **günahları və xətaları silir**.

İbn Macə[102] "əs-Sünən" əsərində Umm Hani[103] yolu ilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyini rəvayət edir: "Lə iləhə illəllah heç bir günah buraxmır və heç bir əməl ondan önə keçəməz."[104]

Sələfdən biri vəfatından sonra yuxuda görülür və ondan halı barədə soruşurlar və deyir: "Lə iləhə illəllah sözü heç bir şey saxlamayıb."

O, **iman barədə öyrənilənləri qəlbdə yeniləyir**.

"əl-Müsnəd"də gəlir ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – səhabələrinə dedi: "İmanınızı yeniləyin!" Soruşdular: "İmanımızı necə yeniləyək?" Dedi: "Lə iləhə illəllah deyin!"[105]

**Heç bir şey çəkidə ona çatamaz**, əgər səmalar və Yerlə ölçülərsə onlardan ağır gələr.

Necəki "əl-Müsnəd"də Abdullah bin Amr yolu ilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət olunur ki, "Nuh ölüm ayağında olarkən oğluna belə demişdir: "Sənə "lə

---

[101] Bunu Əhməd "əl-Müsnəd"də (5/169) və Hənnad bin əs-Sari "əz-Zuhd" kitabında (1071) rəvayət edir. əl-Heysəmi "Məcməuz-Zəvaid"də (10/84) deyir: "Bunu Əhməd rəvayət edir və raviləri siqadır, lakin Şəmir bin Atiyyə bunu şeyxləri vasitəsilə Əbu Zərdən rəvayət edir, şeyxlərindən heç birinin adını çəkməmişdir." Şeyx əl-Albani hədisin həsən olduğunu demişdir.

[102] **Tərcüməçi:** Əbu Abdilləh Muhamməd Yezid; hədis elmindəki imamlardan biridir. Qəzvin əhlindəndir. Hicri 209-cu ildə dünyaya gəlib. "əs-Sünən", "ət-Təfsir" və "ət-Tarix" adlı kitabları qələmə alıb. Hicri 273-cü ildə vəfat edib.

[103] **Tərcüməçi:** Ummu Hani Faxitə bint Əbi Talib bin Abdilmuttalib bin Haşim əl-Haşimiyyə, peyğəmbərin – salləllahu aleyhi va səlləm - əmisi qızıdır. Peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayətləri əl-Kutubus-Sittə'də və başqa kitablarda var. Fəth günü müsəlman olub, radiyallahu anhə! ət-Tirmizi deyir: "Qardaşı Əli'dən də çox yaşamışdır."

[104] İbn Macə (3797) rəvayət edir və "əz-Zəvaid"də deyir: "İsnadında Zəkəriyya bin Mənzur adlı ravi var və o, zəifdir." Bunu Muhamməd Fuad Abdulbaqi – rahiməhullah – qeyd edir.

[105] Bunu Əhməd "əl-Müsnəd"də (2/359), əl-Hakim (4/256) rəvayət edir. əl-Hakim deyir: "Bu, isnadı səhih bir hədisdir, əl-Buxari və Muslim bunu rəvayət etməyib." əl-Hafiz əz-Zəhəbi "ət-Təlxis"də bunu tənqid edərək deyir: "(Sənədindəki) Sadəqa'nı alimlər zəif sayıblar." əl-Hafiz əl-Heysəmi "əl-Məcmə"də (10/85) deyir: "Bunu Əhməd və ət-Təbərani rəvayət edir və Əhmədin raviləri siqadır."

iləhə illəllah"ı əmr edirəm, əgər yeddi göy və yeddi yer sərt bir halqaya qoyulsa, "lə iləhə illəllah" sözü onları dağıdar."[106]

Yenə orada Abdullah bin Amr[107] yolu ilə peyğəmbərdən – salləllahu aleyhi va sələm – rəvayət olunur ki, "Musa – aleyhissələm – demişdir: "Ey Rəbbim! Mənə elə bir şey öyrət ki, onunla Səni zikr edim və onunla Sənə dua edim!" Dedi: "Ey Musa! "Lə iləhə illəllah" de!" Musa dedi: "Ey Rəbbim! Qullarının hamısı bunu deyir." Dedi: "Allahdan başqa haqq məbud yoxdur de!" Dedi: "Səndən başqa haqq məbud yoxdur, mən sadəcə olaraq Səndən elə bir şey istəyirəm ki, onunla başqalarından seçilim." Dedi: "Ey Musa! Əgər yeddi səma və Məndən başqa oradakıların hamısı və yeddi yeri tərəzinin bir gözünə və "lə iləhə illəllah" sözünü digər gözünə qoysan, "lə iləhə illəllah" sözü onlardan ağır gələr."[108]

Elə buna görə də günahların yazılı olduğu səhifələrdən ağır gəlmişdir, necəki bu, "sicillət" və "bitaqa" hədisində gəlmişdir. Bunu Əhməd, ən-Nəsai və ət-Tirmizi yenə Abdullah bin Amr'ın vasitəsilə peyğəmbərdən – salləllahu aleyhi va sələm – rəvayət ediblər.[109]

---

[106] Hədisi Əhməd "əl-Müsnəd"də (2/170, 225) və "əz-Zuhd"də (səh: 67), əl-Hakim "əl-Müstədrək"də (1/49) rəvayət edir. əl-Hakim deyir: " Bu, isnadı səhih bir hədisdir, əl-Buxari və Muslim ("əs-Sahih"də) əs-Saqab bin Zuheyr'in hədislərini rəvayət etməyiblər, beləki o, siqadır, az hədis rəvayət edir." əz-Zəhəbi deyir: "İsnadı səhihdir və əs-Saqab siqadır. İbn Aclən bunu Zeyd bin Əsləm'dən mürsəl şəkildə rəvayət edir." əl-Heysəmi "əl-Məcmə"də (10/87) deyir: "Bunu əl-Bəzzar rəvayət edib və sənədində Muhamməd bin İshaq adlı ravi var və o, mudəllisdir və siqadır. Qalan ravilər isə "əs-Sahih"in raviləridir."

[107] Əlyazmalarda da bu hədis İmam Əhməd'in "əl-Müsnəd" əsərinə və səhabə Abdullah bin Amr'a nisbət olunur. Şeyx əl-Albani deyir: "Yəni "əl-Müsnəd"də rəvayət olunur və hədisi ora aid etmək xətadır. Eynilə bunun Abdullah bin Amr'ın hədisi olduğunu söyləmək də xətadır. Bu Əbu Said əl-Xudri'nin hədisindəndir."

[108] Bunu Əbu Yalə "əl-Müsnəd"də (1393), İbn Hibban (2324; "Məvariduz-Zam'ən"də olduğu kimi) və əl-Hakim "əl-Müstədrək"də (1/528- 529) rəvayət edir. əl-Hakim deyir: "Bu, isnadı səhih bir hədisdir, əl-Buxari və Muslim bunu rəvayət etməyiblər." əz-Zəhəbi onunla razılaşır. əl-Heysəmi "Məcməuz-Zəvaid"də (10/85) deyir: "Bunu Əbu Yalə rəvayət edir, ravilərini alimlər siqa sayıblar, bununla belə bəzilərində zəiflik var."

[109] Abdullah bin Amr bin əl-As'dan – radiyallahu anhu – rəvayət edirlər ki, Allahın Elçisi – salləllahu aleyhi va sələm – demişdir: "Allah Qiyamət günü bütün insanların başında ümmətimdən bir insanı ayıracaq və onun üçün (etdiyi əməllərin yazılmış olduğu) doxsan doqquz qovluq (sicil) açılacaq, hər açılan qovluq gözün görə bildiyi məsafə qədər uzun olacaq. Sonra deyəcək: "Bunlardan bir şeyi inkar edirsənmi? Mənim nəzarətçi mələklərim sənin haqqına zülm ediblərmi?" Deyəcək: "Xeyr, Rəbbim!" Allah deyəcək: "Sənin üzrün varmı?" Deyəcək: "Xeyr, ey Rəbbim!" Allah deyəcək: "Bəli! Yanımızda sənə aid bir həsənə var. Həqiqətən bu gün sənə zülm olunmayacaq." Sonra üzərində "mən şahidlik edirəm ki, Allahdan başqa haqq məbud yoxdur və şahidlik edirəm ki, Muhamməd Onun qulu və elçisidir" sözləri yazılmış bir kağız parçası (bitaqa) çıxarıldı və Allah deyəcək: "Gəl öz çəkini çək!" Deyəcək: "Ey Rəbbim! Bütün bu qovluqlar ilə müqayisədə bu kağız parçası nədir ki?!" Allah deyir: "Həqiqətən sənə zülm olunmayacaq!" Deyir: "Sonra qovluqlar tərəzinin bir gözünə və kağız parçası digər gözünə qoyulacaq. Qovluqların gözü yuxarı qalxacaq və kağız parçası ağır gələcək. Allahın ismi

**Allaha – Azzə və Cəllə - çatana qədər hicabı tam deşib keçən** də bu sözdür.

---

ilə müqayisədə heç bir şey ağır gəlməz!" Bu böyük və əzəmətli hədisi İmam Əhməd "əl-Müsnəd"də (2/213) və ət-Tirmizi "əs-Sünən"də (2639) rəvayət edir. Deyir: "Əbu İsa (ət-Tirmizi) dedi: Bu hədis həsən və ğaribdir." Yenə İbn Macə bunu "zühd" kitabında (4300), əl-Hakim "əl-Müstədrək"də (1/6, 529) rəvayət edir. əl-Hakim deyir: "Bu, səhih bir hədisdir, lakin "əs-Sahiheyn"də rəvayət olunmur. Bu, Muslim'in şərtinə görə səhihdir." əz-Zəhəbi də razılaşmışdır.

Bəziləri zənn etmiş və bu hədisdən elə anlamışlar ki, bu sözləri sadəcə dil ilə deməklə insan atəşdən qurtulur və cənnəti qazanır. Onlar deyirlər ki, hədisdəki bu adam Allahın hüzuruna yalnız bir kəlimə ilə çıxdı. Belə bir anlayış şəri mətnləri hissə-hissə, ayrı-ayrı anlamağın bəhrəsidir, hər bir dəlil ayrılıqda qiymətləndirilir. Beləliklə Allahın sözü ilə peyğəmbərinin sözünü bir-birinə vururlar və imanın söz və əməl olduğunu deyən bu ümmətin sələfinin iman məsələsindəki görüşünə qarşı çıxırlar. Bəs o zaman "lə iləhə illəllah" deyən, lakin Allahın endirdiklərinə nifrət edən münafiqlər haqqında nə deyək?! "Lə iləhə illəllah" dedikləri halda Allahı və Elçisini söyən, Allaha, Elçisinə və möminlərə qarşı gecə-gücdüz müharibə edən kimsələr haqqında nə deyək?! O zaman əhli-sünnətin "iman söz və əməldir" şəklində səslənən etiqadını nə edək?! "əl-Humeydi dedi: Vaki'ni belə deyərkən eşitdim: Əhli-Sünnət deyir: "İman söz və əməldir." Mürciə isə deyir: "İman sözdür." Cəhmiyyə deyir: "İmam Allahı tanımaqdır." Ondan gələn başqa rəvayətdə deyir: "Bu, küfrdür." (İbn Teymiyyə, "əl-İmən", səh: 264) Səhl bin Abdilləh ət-Tustəri iman haqqında deyir: "(İman) söz, əməl, niyyət və sünnətdir. Çünki iman, əgər əməlsiz söz olsa, bu, küfr olar. Əgər niyyətsiz söz və əməl olsaydı, bu, nifaq olardı. Əgər sünnətsiz söz, əməl və niyyət olsaydı bidət olardı." (İbn Teymiyyə, "əl-İmən", səh: 147) əl-Hafiz İbn Hacər "Fəthul-Bari"də deyir: "Əbul-Qasim əl-Laləkay bunu "əs-Sünnə" kitabında əş-Şafi, Əhməd bin Hənbəl, İshaq bin Rahaveyh, Əbu Ubeyd və digər imamlardan bu şəkildə nəql edir. Səhih sənədlə əl-Buxari'dən belə dediyini rəvayət edir: "Müxtəlif ölkələrdə mindən çox alimlə qarşılaşdım və imanın söz və əməl olması, artıq, azalması haqqında onlardan kiminsə ixtilaf etdiyini görmədim." İbn Əbi Hatim və əl-Laləkay bunu çox sayda səhabə, tabiindən və icmanın səhabə və tabiindən üzərilərində dayandığı kəslərdən sənədləri ilə birlikdə nəql edərək bu barədə geniş yazıblar. Yenə Fudeyl bin İyad və Vaki bunu əhli-sünnət val-cəmaət'dən rəvayət etmişdir. əl-Hakim "Mənaqibuş-Şafi"də deyir: "Bizə Əbul-Abbas əl-Əsam rəvayət etdi; bizə ər-Rabi rəvayət etdi; dedi: "əş-Şafi'ni belə deyərkən eşitdim: İman söz və əməldir, artar və azalar." Bunu Əbu Nueym "əl-Hilyə"də əş-Şafi'nin tərcümeyi-halında başqa yolla ər-Rabi'dən rəvayət edir və əlavə edir: "İtaət ilə artır, asilik ilə azalır." (İbn Hacər, "Fəthul-Bari", 1/40) Əbu Muhamməd Abdurrahmən bin Əbi Hatim deyir: "Atamdan və Əbu Zura'dan – radiyallahu anhumə - əhli-sünnətin məzhəbləri haqqında, bütün ölkələrdə qarşılaşdıqları alimlərin nəyə etiqad etdiklərinə və onların özlərinin bu barədə nəyə etiqad etdiklərini soruşdum." Hər ikisi də dedi: "Biz bütün ölkələrdə, Hicaz, İraq, Misir, Şam və Yəməndə alimlərlə qarşılaşdıq və onların məzhəbləri bu idi ki, iman söz və əməldir, artar və azalar." ("Aqidətu Əbi Hatim ər-Razi və Əbu Zura ər-Razi", səh: 37-38) Əbu Zura – rahiməhullah – deyir: "Bizə görə iman söz və əməldir, artır və azalır. Kim bundan başqa şey deyərsə o, bidət əhlidir, mürciədir." (əvvəlki mənbə: səh: 150)

Bu şəri mətni və başqa şəri mətnləri şəriət çərçivəsində anlamaq lazımdır ki, müxtəlif dəlillər bir-arada nəzərdən keçirilsin. Bununla şəriətin bir-birindən asılı olmayacaq şəkildə parçalanmasının və hər bir kəsin öz payını, öz nəfsinin istədiyini götürməsinin qarşısı alınmış olur. Bununla da Quranın "Onlar Quranı hissələrə böldülər" (əl-Hicr, 91) sözünün bizlərə aid olmasından qurtulmuş oluruq.

ət-Tirmizi isə Abdullah bin Amr yolu peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyini rəvayət edir: "Lə iləhə illəllah" sözünün Allaha çatması üçün Allah ilə arasında heç bir hicab yoxdur."[110]

Yenə orada Əbu Hureyrə vasitəsilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət olunur: "Böyük günahlardan uzaq durduğu müddətdə ixlas ilə "lə iləhə illəllah" demiş elə bir qul yoxdur ki, (həmin söz) Ərşə yetişənə qədər göyün qapıları o qulun üzünə açılmamış olsun!"[111]

Mərfu olaraq İbn Abbasdan rəvayət olunur: "Elə bir şey yoxdur ki, onunla Allah arasında bir hicab olmasın, lakin "lə iləhə illəllah" sözü bundan istisnadır. Sənin dodaqların o sözün qarşısında durmadığı kimi Allaha – Azzə və Cəllə - yetişənə qədər heç bir şey onun qarşısında durmaz."[112]

Əbu Umamə deyir: "Lə iləhə illəllah deyən elə bir qul yoxdur ki, Ərşə ilə onun arasında bir şey qarşısını alsın!

Bu sözü **deyənin Allah üzünə baxar və onun duasını qəbul edər**.

ən-Nəsai "əl-Yəum val-Leylə" adlı kitabında səhabədən iki nəfər vasitəsilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət edir: "Kim "lə iləhə illəllah, vahdəhu, lə şərikə ləh, ləhul-mulku va ləhul-həmd və huva alə kulli şeyin qadir" sözlərini ruhu bu sözə münasibətdə ixlaslı olaraq, qəlbində və dilində bu sözü təsdiqləyərək deyərsə, Allah onun üçün göyü yarar ki, Yer üzündə bu sözü deyən kimsəyə baxar. Allahın baxdığı kimsə isə Ona öz diləyini çatdırmaq haqqını qazanmış olur."[113]

O, elə bir sözdür ki, **onu deyəni Allah təsdiq edir**.

Necəki ən-Nəsai, ət-Tirmizi və İbn Hibban Əbu Hureyrə və Əbu Said'in hədisin rəvayət edirlər ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – demişdir: "Qul əgər "Allahdan başqa haqq məbud yoxdur, O, ən Böyükdür" deyərsə, Rəbbi onun sözünü təsdiqləyər və deyər: "Məndən başqa haqq məbud yoxdur və Mən ən Böyüyəm!" Əgər "Allahdan başqa haqq məbud yoxdur, O, Təkdir" deyərsə, Allah deyir: "Məndən başqa haqq məbud yoxdur və Mən Təkəm." Əgər "Allahdan başqa haqq məbud yoxdur, O, təkdir və heç bir şəriki yoxdur" deyərsə, Allah deyər: "Məndən başqa haqq məbud yoxdur, Təkəm və heç bir şərikim

---

[110] Bunu ət-Tirmizi (3518) rəvayət edir və hədisi bu sözləri ilə zəif sayır: "Bu hədis bu rəvayət yolu ilə ğaribdir və isnadı güclü deyildir."

[111] ət-Tirmizi (3590) bunu rəvayət edir və deyir: "Bu hədis bu yolla həsən-ğaribdir."

[112] Bunu tapa bilmədim.

**Tərcüməçi:** Eləcədə Şeyx əl-Albani deyir: "Bunu tapa bilmədim, hətta "əl-Cami əl-Kəbir" kitabında belə tapa bilmədim.

[113] ən-Nəsai, "Aməlul-Yəumi val-Leylə", rəq: 28

yoxdur.” Əgər “Allahdan başqa haqq məbud yoxdur, Təkdir və heç bir şəriki yoxdur, bütün mülk Onundur və bütün həmdlər Onundur” desə Allah deyər: “Məndən başqa haqq məbud yoxdur, bütün mülk Mənimdir və bütün həmdlər Mənimdir.” Əgər “Allahdan başqa haqq məbud yoxdur, Allahdan başqa heç kəslə nə güc, nə də qüdrət yoxdur” desə Allah deyər: “Məndən başqa haqq məbud yoxdur və Məndən başqası ilə nə güc, nə də qüdrət yoxdur.” Belə deyərdi: “Kim xəstə olarkən bu sözü deyər və sonra ölərsə, onu atəş yeyə bilməz.”[114]

O, Ərəfə gününün duasında gəldiyinə görə **peyğəmbərlərin dedikləri ən əfzəl sözdür**.[115]

O, **zikrlərin ən əfzəlidir**.

Necəki Cabirin mərfu hədisində gəlmişdir: “Zikrlərin ən fəzilətlisi “lə iləhə illəllah” sözüdür.”[116]

İbn Abbas’dan belə dediyi rəvayət olunur: “Allahu Təaləyə olan (“lə iləhə illəllah”) kəliməsini sevirəm, Allah onsuz heç bir əməli qəbul etmir.”

O, **əməllərin ən fəzilətlisidir**, sayca ən çoxudur, qulları azad etməyə bərabərdir və şeytandan bir qorunmadır.

Necəki “əs-Səhiheyn”də Əbu Hureyrə - radiyallahu anhu – vasitəsilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət olunur: “Kim “lə iləhə illəllah, vahdəhu lə şərihə ləh, ləhul mulku va ləhul həmd va huvə alə kulli şeyin qadir” deyərsə, bu, onun üçün on qul azad etməyə bərabərdir və ona yüz həsənət yazılır və ondan yüz pis əməl silinər və gecələyənə qədər həmin günü onun üçün şeytandan bir müdafiə olur və heç kəs onun etdiyindən daha fəzilətli bir əməl edə bilməz, lakin kiminsə ondan daha çox etməsi istisnadır.”[117]

---

[114] ən-Nəsai “Əməlul-Yəumi val-Leylə” kitabında (rəq: 30-31), əl-Hakim “əl-Müstədrək”də (1/5) rəvayət edir. əl-Hakim deyir: “Bu hədis səhihdir, lakin “əs-Sahiheyn”də rəvayət olunmayıb.” əz-Zəhəbi “ət-Təlxis”də deyir: “Şu’bə və başqaları bu hədisi məvquf olaraq rəvayət edirlər.” Bunu eləcədə İbn Hibban (2325; məvarid) və Əbu Yalə (6153, 6154, 6163) buna yaxın ləfzlə rəvayət edir. Yenə İbn Macə (3794) və ət-Tirmizi (3430) rəvayət etmişdir. ət-Tirmizi deyir: “Bu hədis həsən-ğaribdir.”

[115] Bunu İmam Malik “əl-Muvatta”da (246) rəvayət edir. İbn Abdilbərr dedi: “Bunu Malikdən mürsəl olaraq rəvayət etməkdə ravilər ixtilaf etməyiblər (yəni, hamı mürsəl rəvayət edib).” Bunu Muhamməd Fuad Abdul-Baqi – rahiməhullah – ifadə etmişdir. Bu rəvayəti eləcədə ət-Tirmizi (3585) rəvayət edir və deyir: “Bu, bu yolla ğarib bir hədisdir.” Lakin hədis şahidləri ilə birlikdə həsəndir.

[116] Bunu ət-Tirmizi (3383), İbn Macə (3800), İbn Hibban (2326; məvarid) və əl-Hakim “əl-Müstədrək”də (1/498, 503) rəvayət edir. ət-Tirmizi deyir: “Bu, həsən-ğarib bir hədisdir, bunu Musa bin İbrahim’in hədisindən başqa rəvayətdən tanımırıq.” əl-Hakim deyir: “Bu, isnadı səhih bir hədisdir, lakin əl-Buxari və Muslim bunu rəvayət etməyiblər.” əz-Zəhəbi onunla razılaşmışdır.

[117] əl-Buxari (4/95 və 7/167); Muslim (2691); ət-Tirmizi (3468); Əhməd, “əl-Müsnəd” (2/302, 375)

Yenə "əs-Səhiheyn"də Əbu Əyyub yolu ilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət olunur: "Kim bu sözləri on dəfə deyərsə bu, onun üçün İsmayılın övladlarından dörd canı azad etməyə bərabərdir."[118]

ət-Tirmizi "əs-Sünən" əsərində İbn Ömər'dən mərfu olaraq rəvayət edir: "Kim bazara daxil olarkən o sözləri deyərsə və "yuhyi və yumit" sözlərini əlavə edərsə ona milyon dənə həsənət yazılar və ondan milyon dənə pis əməl silinər və milyon dərəcə dəyəri yüksələr."[119]

Bir başqa rəvayətdə isə gəlir ki, "Cənnətdə onun üçün bir ev tikilər."

Bu sözün fəzilətlərindən biri də budur ki, **insanı qəbir evində tənhalıqdan və həşr zamanının qorxusundan qoruyur.**

"əl-Müsnəd" və başqa kitablarda peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyi rəvayət olunur: "Lə iləhə illəllah əhli üçün nə qəbirlərində, nə də yenidən dirilişlərində heç bir tənhalıq yoxdur, sanki mən "lə iləhə illəllah" əhlinin yanında durmuşam, ayağa durub başlarındakı torpağı çırpırlar və deyirlər: "**Qəm-qüssəni bizdən uzaq edən Allaha həmd olsun!**" (Fatir, 34)[120]

Mursəl bir hədisdə isə deyilir: "Kim hər gün yüz dəfə "lə iləhə illəllahul-məlikul-haqqul-mubin" deyərsə onun üçün fəqirlikdən əminlik olar, qəbir tənhalığında onun üçün gözəl yoldaşlıq olar, onunla zənginlik əldə edər və onunla cənnət qapısını döyər."

O, **qəbirdən qalxarkən möminlərin şüarıdır**.

ən-Nadr bin Arabi deyir: "Mənə xəbər çatıb ki, insanlar qəbirlərindən qalxarkən şüarları "lə iləhə illəllah" olacaq.

---

[118] əl-Buxari (7/167); Muslim (2693)

[119] Bunu ət-Tirmizi (3428), İbn Macə (2235), Əhməd "əl-Müsnəd"də (1/47) və əl-Hakim "əl-Müstədrək"də (1/538-539) rəvayət edir. ət-Tirmizi deyir: "Bu, ğarib bir hədisdir."

[120] Şeyx əl-Albani deyir: "Bu, bir xətadır; hədis Əhmədin "əl-Müsnəd" əsərində deyil. Bunu yalnız İbn Əbid-Dunyə, İbn Adiy və başqaları çox zəif bir sənədlə rəvayət edirlər. əl-Munziri bunu münkər gördümşdür. Bunu "əs-Silsilə əd-Daifə"də (3853) təxric etmişəm."

Hədisi əl-Beyhəqi "əş-Şuab"da (rəq: 99) rəvayət edir və deyir: "Bu hədis zəif olan başqa bir yolla da İbn Ömərdən rəvayət olunub."əl-Heysəmi "Məcməuz-Zəvaid"də (10/86) deyir: "ət-Tabərani "əl-Əvsat"da rəvayət etmişdir." Başqa bir rəvayətdə isə sözlər belədir: "Lə iləhə illəllah" əhli üçün nə ölüm zamanı, nə də qəbirdə tənhalıq yoxdur." Birinci rəvayətin sənədində Yəhya əl-Həmmani, ikincində isə Məcaşiu bin Ömər adlı ravi var və hər ikisi də zəifdir. əl-Heysəmi "əl-Məcmə" (10/336) rəvayət edir: "ət-Tabərani bunu rəvayət edib və sənədində tanımadığım ravilər var."

ət-Tabərani mərfu bir hədis rəvayət etmişdir: “Bu ümmətin Sirat körpüsü üzərindəki şüarı “lə iləhə illə əntə” olacaq.”[121]

Onun fəzilətlərindən biri də budur ki, **bu sözü deyən üçün cənnətin səkkiz qapısını açacaq**.

O qapılardan dilədiyindən daxil olacaq, necəki dəstəmazdan sonra iki şəhadət kəliməsini söyləyən haqqında peyğəmbərdən – salləllahu aleyhi va səlləm –rəvayət olunan Ömərin hədisində gəlmişdir və bunu Muslim rəvayət edir. [122]

“əs-Səhiheyn”də Ubadə yolu ilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyi rəvayət olunur: “Kim “əşhədu əllə iləhə illəllah, vahdəhu lə şərikə ləhu va ənnə Muhammədən abduhu va rasuluhu va ənnə İsə abdullahi va kəlimətuhu əlqahə ilə Məryəmə va ruhun minhu va ənnəl-cənnətə haqqun va ənnən-nəra haqqun va ənnəllahə yəb’asu mən fil-qubur” (Allahdan başqa haqq məbud olmadığına, Tək olduğunə və heç bir şəriki olmadığına, Muhammədin onun qulu və elçisi olduğuna, İsa onun qulu, Məryəmdə yerləşdirdiyi kəliməsi və Ondan olan bir ruh olduğuna, cənnətin haqq olduğuna, atəşin haqq olduğuna və Allahın qəbirdəkiləri diriltdiyinə şahidlik edirəm) sözlərini deyərsə, onun üçün cənnətin səkkiz qapısı açılar və dilədiyi qapıdan daxil olar.”[123]

Abdur-Rahmən bin Səmura’nın peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət etdiyi onun uzun yuxusunun hekayəsi haqqındakı hədisdə isə deyir: “Ümmətin cənnətin qapılarına çatmış bir nəfər gördüm, qapılar onun qarşısında bağlanmışdı, sonra “lə iləhə illəllah” şəhadəti gəldi və qapılar həmən açıldı və onu cənnətə daxil etdi.”[124]

Bu sözün fəzilətlərindən biri də budur ki, “lə iləhə illəllah” sözünün hüquqlarında yol verdikləri qüsurlara görə bu sözün əhli cəhənnəmə daxil olsalar belə oradan mütləq çıxacaqlar.

“əs-Səhiheyn”də Ənəs yolu ilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyi rəvayət olunur: “Allah – Azzə və Cəllə - dedi: “İzzətimə, cəlalıma, böyüklüyümə və əzəmətimə and olsun ki, “lə iləhə illəllah” demiş hər bir kəsi oradan çıxaracam.”[125]

ət-Tabərani də Ənəs yolu ilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – belə dediyini rəvayət edir: “Həqiqətən “lə iləhə illəllah” əhlindən bir qrup insan günahlarına görə atəşə

---

[121] əl-Heysəmi “əl-Məcmə”də deyir: “Bunu ət-Tabərani “əl-Kəbir” və “əl-Əvsat”da rəvayət edir, sənədində zəif olmasına baxmayaraq (bəzi alimlər tərəfindən) siqa sayılmış ravi var. (Sənədindəki) Abdus bin Muhamməd adlı ravini isə tanımadım.”

[122] Muslim (234)

[123] Daha əvvəl təqdim olundu.

[124] əl-Heysəmi “əl-Məcmə”də (7/183) deyir: “Bunu ət-Tabərani iki isnad ilə rəvayət edir, birinci isnadda Süleyman bin Əhməd əl-Vasiti, ikincisində isə Xalid bin Abdir-Rahmən əl-Məxzumi adlı ravi var və hər ikisi də zəifdir.”

[125] Təxrici daha əvvəl təqdim edildi.

daxil olacaqlar, Lat və Uzza əhli onlara deyəcək: “Lə iləhə illəllah” sözü sizi atəşdən qorumadı.” Allah bunlara qəzəblənəcək və onları atəşdən çıxaracaq və cənnətə daxil edəcək.”[126]

Əgər Onun qəzabına düçar olmuş biri muhsin ola bilərsə, o zaman görün Onun razı qaldığı kimsə necədir?! Onun hüququnda və tövhidində qüsur etmiş olsa belə Ona tövhidlə ibadət edən kimsə ilə Ona şərik qoşan kimsə heç zaman bir ola bilməz.

Sələfdən biri demişdir: “İbrahim – aleyhissələm – deyərdi: “Allahım! Sənə şərik qoşanı Sənə şərik qoşmayana şərik etmə!”

Sələfdən biri isə duasında deyərdi: “Ay Allahım! Sən cəhənnəm əhli haqqında deyirsən ki, onlar “**Allah, ölən bir kimsəni diriltməyəcəkdir!” – deyə Allaha möhkəm and içdilər.**” (ən-Nəhl, 38) Biz isə Allaha möhkəm and içirik ki, “Allah ölən bir kimsəni mütləq diriltəcək.” Allahım! Bu iki tərəfi bir yuvada birləşdirmə!”

Əbu Süleyman deyərdi: “O məni paxıllığıma görə axtararsa, mən Onu comərdliyinə görə axtararam. O məni günahlarıma görə axtararsa, mən Onu bağışlamağına görə axtararam. Əgər məni cəhənnəmə daxil etsə Onu sevdiyimi atəş əhlinə xəbər verərəm.

**ما أطيب وصلة وما أعذبه      وما أثقل هجره وما أصعبه**

**في السخط وفي الرضى ما أهيبه      القلب يحبه وإن عذبه !**

**Onun gəlişi necə gözəl, necə şirindir**

**Onun ayrılığı nə ağır, necə çətindir?!**

**Qəzəblənsə də, razı olsa da necə heybətlidir?**

**Əzab versə də qəlb Onu sevir!**

Hətta ariflərdən biri bütün gecəni ağlayar və deyərdi: “Əgər mənə əzab versə yenə Səni sevənəm, əgər mənə rəhm etsən yenə Səni sevənəm! Ariflər əzab olunmaqdan çox Allahdan ayrı düşməkdən qorxurlar.

---

[126] əl-Heysəmi “Məcməuz-Zəvaid”də (10/383) deyir: “Bunu ət-Təbərani “əl-Əvsat”da rəvayət edir və sənədində tanımadığım ravilər var.” Lakin hədisi şahidləri var, beləliklə bu şahidlərlə hədis güclənir və səhih olur. əl-Heysəmi bundan əvvəl 382-ci səhifədə Cabir bin Abdilləh’dən rəvayət olunan hədisi zikr edir: “Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: “Ümmətimdən bir qrup insan günahlarına görə əzab görəcək və Allahın dilədiyi qədər cəhənnəmdə qalacaqlar. Sonra şirk əhli onları lağa qoyacaqlar: “Sizin təsdiqinizin və imanınızın sizə fayda vermədiyini görürük” Bundan həmən sonra Allah cəhənnəmdən bütün muvahhidləri çıxaracaq. Sonra Allahın Elçisi – salləllahu aleyhi va səlləm – bu ayəni oxudu: “Kafirlər mütləq müsəlman olmalarını arzulayacaqlar.” (əl-Hicr, 2) Deyirəm: [Sözü deyən əl-Heysəmi’dir] Cabir’in bundan başqa məzmunda “əs-Sahih”də hədisləri var, bunu isə ət-Təbərani “əl-Əvsat”da rəvayət edir və raviləri “əs-Sahih”in raviləridir. Bəssam əs-Sayrafi istisnadır, lakin o da siqadır.”

Zu’n-Nun deyir: “Ayrılıq qorxusu ilə müqayisədə əzab qorxusu zəngin dənizdə bir damla su kimidir.”

Onlardan biri belə deyərdi: “İlahım, Seyyidim və Mövlam! Əgər bütün əzabınla mənə əzab versən də, Sənə yaxın olmaq üçn əldən qaçırdığım imkanlar mənim üçün əzabdan da pisdir.”

Onlardan birindən soruşdular: “Əgər səni geri çevirsə nə edərsən?” Dedi:

**أنا إن لم أجد من الحب وصلا … رمت في النار منزلاً ومقيلا**

**ثم أزعجت أهلها بندائي … بكرة في عرصاتها وأصيلا**

**معشر المشركين نوحوا على من … يدعي أنه يحب الجليلا**

**لم يكن في الذي ادعاه محقا … فجزاه به العذاب الطويلا !**

**Əgər sevgimə qovuşmaq mənə qismət olmasa,**

**Atəşə qalacağım yer, gözləyəcəyim yer olaraq atılsam,**

**Sonra cəhənnəm ərəsətində durub sabah axşam,**

**Atəş əhlini çağırışımla rahatsız edərdim,**

**Ey müşriklər! Üz tutun!**

**əl-Cəlili sevdiyini iddia edən kəsə tərəf üz tutun!**

**Ola bilməz ki, iddia etdiyi şeydə haqlı olsun**

**Və Allah onu uzun bir əzabla cəzalandırsın!**

## Allah! Allah!

## Ey insanlar! Dininizin əslindən möhkəm tutunun!

Bu gün tövhidi reallaşdırmaq üçün cəhd göstərin, çünki ondan başqa heç bir şey insanı Allaha çatdırmır! Tövhidin hüquqlarını yerinə yetirməyə çalışın, çünki ondan başqa heç bir şey insanı Allahın əzabından xilas edə bilməz![127]

ما نطق الناطقون إذا نطقوا     احسن من لا اله إلا هو

تبارك ذو الجلال ومـن     اشهد أن لا اله إلا هو

من لذنوبي ومن يمحصـها     غيرك يا من لا اله إلا هو

جنان خلد لمن يوحـده     اشهد أن لا اله إلا هو

نيرانه لا تحرق مـن     (حقق) أن لا اله إلا هو

أقولها مخلصا بلا بخـل     اشهد أن لا اله إلا هو

**Deyənlər dediklərində "lə iləhə illəllah" sözündən gözəlini deməyiblər,**

**Cəlalət sahibi və Özündən başqa haqq məbudun olmadığına şahidlik etdiyim mübarəkdir!**

---

[127] əl-Alləmə Siddiq Həsən Xan – rahiməhullah – "əd-Dinul-Xalis" adlı kitabında (1/185) deyir: "Allah! Allah! Ey insanlar! Allahın sizin üçün din olaraq razı olduğu, peyğəmbərinizin ona dəvət etdiyi, onun uğrunda müşriklərlə vuruşduğu, bizi ona təşviq etdiyi və bunda Allah uğrunda haqq cihad ilə cihad etdiyi bu dinin əslinə sarılın! Bu dinin əsası, başı və çırağı "lə iləhə illəllah" şəhadətidir, yəni Allahdan başqa məbud yoxdur. Bunun mənasını bilin və bunun üzərində doğru əməlli olun! Hüccətin tamamlanması və gediləcək yolun izahı üçün Allahın Elçisinə - salləllahu aleyhi va səlləm – tabe olaraq insanları dəvət edin və həmin kəliməni zamanınızın övladları arasında əbədi qalıcı bir kəlimə edin! Bu sözün əhlindən olun! Onun əhlini sevin, onlar sizdən uzaqda yaşasa da onları dində öz qardaşlarınız hesab edin! Tağutlara küfr edin, onlarla düşmənlik edin, onlara nifrət edin! Onları sevənlərə və ya münaqişə edərək onları müdafiə edənlərə, onları təkfir etməyənlərə və ya "mənim onlarla nə işim var ki?" deyən və ya "Allah səni onlara görə mükəlləf qılmamışdır!" deyən kəslərə nifrət edin! Çünki bu insan Allaha qarşı yalan danışmış, iftira etmişdir, beləki Allah həqiqətəndə onu onlarla mükəlləf etmişdir. Qardaşlarınız və övladlarınız olsa belə onlara küfr etməyi, onlardan bəraət etməyi fərz etmişdir. Allah! Allah! Buna sarılın! Ümid olunur ki, şirk qoşmadan Rəbbinizlə qovuşasınız."

**Tərcüməçi:** Bu sözlər əslində Şeyx Muhamməd bin Abdilvahhab'a aiddir. (bax: "Məcmuatut-Təuhid", səh: 111) Lakin kitabı təhqiq edən Sabri bin Sələmə bunu Şeyx Siddiq Həsən Xanın adından nəql edir.

**Günahlarımı Səndən başqa təmizləyən kimdir?! Ey Özündən başqa haqq məbud olmayan!**

**Ona tövhid ilə ibadət edənlərə əbədi qalıcı cənnətlər var,**

**Ondan başqa haqq məbudun olmadığına şahidlik edirəm!**

**Ondan başqa haqq məbudun olmaması sözünə əməl edəni,**

**Atəşləri heç zaman yandırmaz!**

**Heç bir paxıllıq olmadan tam ixlasla bu sözləri deyirəm:**

**"Şahidlik edirəm ki, Allahdan başqa haqq məbud yoxdur!"**

Sözümüzün axırında:

Val-həmdulilləhi vahdəhu va salləllahu alə seyyidinə Muhammədin va alihi va səlləmə təslimən kəsiran va həsbunəllahu va niməl-vakil va lə həulə va lə quvvətə illə billəhil-aliyyil-azim!